***Mən Aşıq, ya qeyb Alı,***
***Xoş gördük, ya Qeybalı.***
***Qarı düşmən dost olmaz,***
***Yedirsən yağı, balı.***
**Sarı Aşıq**



**№2(13)**
**2014**

**Bakı-2014**

**Laçın yurdu, №2(13), 2014**
**Bakı, "Bəxtiyar-4", 2014. – 96 səh.**



Hüquqi ünvan:
**Mərdanov qardaşları – 98.**
Əlaqə:
**Tel.: (050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92**
**e-mail: lachinyurdu@mail.ru**

Dərgidə dərc olunan yazılar müəlliflərin mövqeyini əks etdirir
və yazı müəllifləri məsuliyyət daşıyır.
Jurnal 16.03.2010-cu il tarixdə Azərbaycan Respublikasının Ədliyyə
Nazirliyində 3133 №-li reyestrlə qeydiyyatdan keçmişdir.

Bankın adı: **Azərbaycan Beynəlxalq Bankı MƏTBUAT şöbəsi**
Bankın kodu: **805142**,
Müxbir hesabı:
**AZ03NABZ01350100000000002944,**
VÖEN: **9900001881**
SWIFT: **IBAZAZ2X**,
Müştərinin hesabı:
**AZ64IBAZ41040019443136196216**
**Məmmədov Arif Kamran oğlu**
VÖEN:**1401771462**

Intermediary Bank:
**Citibank NA, New York, USA**
Corr. account: **36083186**
SWIFT: **IBAZAZ2X**,
International Bank of Azerbaijan Republic
Yasamal Branch
kod: **805142**
USD only Account #:
**AZ64IBAZ41040019443136196216**
**Mammadov Arif Kamran**
INN**: 1401771462**

## BU SAYIMIZDA

**_Publisistika_**
Fəxri UĞURLU, "*Vətənim adamlar"* .................................................... 5
Sitarə CABBARLI, *"Babamın gündəliyi" (III hissə)*............................ 38
Məhərrəm QASIMLI, *"Dağların laçın aşığı"* ...................................... 42
Elçin HƏSƏNOV, *"Ermənilərin qənimi laçınlı seyid Həmid"* ............ 70

**_Məktəblərimiz_**
Venera MİRZƏYEVA, *"Mişni məktəbi"* .............................................. 7

**_Anım_**
Məlahət AĞAYEVA, *"Laçın rayonunun işğalından iyirmi iki il keçir"* 13
Sayad QARAYEVA, *"Elşadsız günlər"* ................................................ 19
Osman ALIYEV,
"*Mərdanəliyin və kişiliyin ünvanı – Məhəbbət Kazımov"* ..................... 67

**_Laçın toponimləri_**
Bulaqlar, çaylar, göllər ........................................................................... 16

**_Müsahibə_**
Arif MƏMMƏDLİ, *"Gərək vəzifədə işləyən adam anlasın ki,*
*nə vaxtsa bu vəzifədən gedəcək"* ............................................................ 21
Siyavuş ƏMİRLİ, "*Ruhən Azərbaycanda yaşayıram"* ........................... 51

**_Poeziya_**
Elman ELSEVƏR ...................................................................................... 34
Şəmsəddin QARAKEÇDİ ........................................................................ 47
Yeganə İSMAYILQIZI ............................................................................. 55
Yadigar HƏŞİMOV .................................................................................. 63
Ceyran QURBANOVA ............................................................................. 66
Solmaz CAHANGİROVA ......................................................................... 74
Arif PƏNAHOĞLU ................................................................................... 85
Mübariz SÜLEYMANLI .......................................................................... 90

**_Axtar babaları_**
İbrahim Məmmədov .................................................................................. 46
Mir Heydər ağa ......................................................................................... 48
Seyid Əhəd ağa ........................................................................................ 49

***Bioqrafik tanıtım***

Məhyəddin CABBAROV ........................................................................50

***Kimlər keçdi bu dünyadan***

Dilafət RƏSULOV, *"Bir məktubun sorağıyla – Məhi dayıdan xatirələr"*56

***Kitab rəfi***

"Dünya, salamat qal…" ..........................................................................65
"Ayrı adam" ..........................................................................................83
"Qürbətə sığmayan vətən həsrəti"..........................................................87
"Ruhu gileyli anam"...............................................................................91

***Ovqat***

Sultan HÜMBƏTOV, *"Qəlbi həsrət yüklü şair"* ....................................76
Vəliş ZİRVƏLİ, *"Qara günlərin şahidi ağ saçlı Giya"* ........................80
Şərif AĞAYAR, *"Ən bədbəxt söz adamı"* ............................................82

***Araşdırma***

II Dünya Müharibəsində həlak olan laçınlılar.........................................88

**HÖRMƏTLİ OXUCULAR!**

**"Hər kənddən, hər məktəbdən 1 abunəçimiz olsun, hər kəs 1 jurnal alsın!"** kampaniyası davam edir. Bu kampaniyaya qoşulanlara bəri başdan öz təşəkkürümüzü bildiririk.

Xatırladaq ki, jurnalımızı "Azərmətbuatyayımı"nın Sumqayıt, Gəncə, Mingəçevir, Bərdə, Ağcabədi, Yevlax, Qax və Şəki şəhərlərindəki köşklərindən, həmçinin ***(050) 291-34-52, (070) 956-36-22, (050) 205-00-92*** nömrələrinə zəng etməklə əldə etmək olar.

**Əziz oxucular,** jurnalımız hələlik rübdə bir dəfə (ildə 4 nömrə) çıxır, **illik abunə qiyməti 8 manatdır.** İnşallah, növbəti sayımız **2014-cü ilin sentyabr ayında** işıq üzü görəcək.

**PUBLİSİSTİKA**



**Fəxri UĞURLU**

## VƏTƏNİM ADAMLAR

*Laçınlılara, o cümlədən kəndlilərimə həsr olunur.*

...Çınqılın başından fermaya enəndə qabağımızdan bir it qaçdı, bizi görən kimi səssiz-səmirsiz, hürmədən, zingildəmədən bir göz qırpımında yox oldu. Heç qorxmağa da macal tapmadıq. Ancaq mən o iti tanımağa macal tapdım – fermanın itlərindənidi. O itlər bir neçə ay irəliyəcən atlını atdan salırdı, uçan quşa sıçrayırdı. İndi o itlərin qalanı hardaydı – köçaköç vaxtı mal-heyvana qoşulub getmişdimi, acından ölmüşdümü, düşmən buralara “əl gəzdirəndə” güllə qabağına çıxmışdımı – bilmirəm, ancaq nəydisə, qabağımızdan qaçan itin gözü möhkəm qırılmışdı, bəlkə də gözünün qabağında itləri hürdüyünə görə öldürmüşdülər. Burası bəlliydi ki, o it daha özünü bu yerin-yurdun yiyəsi saymır, qorumağa obası, hürməyə doğma adamı qalmayıb, yuvası bir gecədə yağı düşərgəsinə dönüb, zənciri qırmağına qırıb, ancaq azad ola bilməyib, getməyə yer tapmayıb və indi heç acından ölmək qorxusu da onun insana etibarını, sədaqətini geri qaytara bilməz...

Kəndə çataçatda işğalın ilk gördüyüm əlaməti bu oldu. Sonra ot basmış qəbiristanlıq, ortasında ağac pöhrələmiş yol, alaqlamış divarlar, cəngəl basmış bostan yerləri. Çardağı üstünə uçmuş evlər...

Mən sizə 1992-ci ilin avqustundan danışıram. O zamandan ki, Laçın artıq üç ayıdı alınmışdı, bizim kəndin camaatı camaatlara qoşulub Kəlbəcər üzə adlamışdı, qonşu rayonda da bənd almayıb Murovun Gəncə üzünə aşmışdı, dağların dumanlı-çiskinli ətəyində, günün eyni açılmayan acı bir yurdda, taleyin yolu üstündə alaçıq qurub xəbər gözləyirdi. Bir azdan o camaat arxayınlaşıb gəldiyi yolla geri qayıdacaqdı, qışı kənddə çıxarıb, yazda bu dəfə Kəlbəcər alınanda öz ocağının qırağındaca mühasirəyə düşüb yalnız möcüzə sayəsində əsir alınmaqdan qurtulacaqdı...

Onda hələ bir neçə ay sonra Kəlbəcərin də əlimizdən gedəcəyi ağlımıza gəlməzdi və yatsam yuxuma da girməzdi ki, doqquz il sonra Laçının ikinci dəfə – bu dəfə sənədli-sübutlu düşmənə təhvil verilməsi təhlükəsi qarşısında qala bilərik. Onda hələ düşmənin bu gün-sabah ölkədən qovulacağını gözləyirdik və mən dağların çiskindən göz açılmayan ətəyində kənddən ötrü bərk

darıxdığımdan yola çıxıb, "İstisu" şüşəsi daşıyan bir yük maşınıyla Murovu aşmışdım, maşın dəyişə-dəyişə gəlib kəndimizə çıxmışdım. Mal-heyvan dırnağı dəyməyən yamacların, yastanaların, kərənti ağzına düşməmiş biçənəklərin otu özünə boy vermişdi, ayağıma dolaşırdı. Cığırlar iz itirməyə başlamışdı. Torpaq üz-gözünü saç-saqqal basmış səfilə oxşayırdı.

Kəndin xatirəsinə qarovul çəkən beş-altı tay-tuşum bir evə yığılmışdı. Otuza yaxın ev, o cümlədən neçə-neçə nəslin əvəzsiz xatirə arxivi olan qədim məktəb binası yandırılmışdı, üstünün dəmiri saçaq-saçaq doğranmışdı. Külə dönmüş divarlara əl atırdın, daşı əlində gəlirdi. Evlər, həyətlər, bağçalar, bostanlar ağzıgünə qalmışdı. Uşaq vaxtı meyvəsini daşladığımız, barını oğurladığımız ağaclar indi özü budaqlarını bizə sarı uzatmışdı, ancaq ağacların payına yiyə duran yoxudu. Burda insanın azadlığı fermada gördüyüm o itin azadlığından fərqlənmirdi...

Kəndin bütün pişikləri biz qaldığımız evə yığılmışdı – ömrümdə heç vaxt o qədər pişiyi bir yerdə görməmişəm. Deyəsən, yurda dönük çıxmayan təkcə elə pişiklərdi. Əlinə bir tikə aldınmı, miyoltudan qulağın tutulurdu; ac pişiklər altdan-yuxarı insan səsiylə yalvarışırdı.

Qonşumuzun iti məni görəndə bir ağız hürüb, qaçıb tövləyə girdi. Sən demə, boz qancıq küçükləyibmiş, hürməyi də balalarına görəymiş. Yoxsa o sakitlikdə hürməkmi yada düşərdi – adam öz səsindən diksinirdi, bir quşun səsi dağları yerindən tərpədirdi... Sonra boz qancığın küçükləri azalmağa başladı; uşaqlar dedilər ki, it acından balalarını yeyir.

Mən ot otlayan it də gördüm. Bir sözlə, gözə görünən nə vardısa, hamısı indiyəcən görünməmiş bir şəkil almışdı, anormal hala düşmüşdü: torpaq da, təbiət də, heyvan da, insan da. Yadımdadı, xamır yoğuran tay-tuşlarımı, anabacısız, arvad-uşaqsız qalıb yetimləşən kişiləri görməyə alışmadığım bir halda – çörəkbişirmə əməliyyatının hansısa mərhələsində nəyinsə üstündə mübahisə eləyən görəndə necə kövrəlmişdimsə, məni bir dəli gülmək tutmuşdu, uşaqlar da mənə qoşulmuşdular və eləcə gülə-gülə xamırı yoğurub kündələyib çörəyi bişirmişdilər.

Mən o gülüşün tarixini yazmağa bütün ömrümü həsr eləyərdim...

Hər şey öz yerindəydi – Vətən ayağımın altında, gözümün qabağında, ovcumun içindəydi; havası ciyərimdə, qoxusu burnumda, dadı damağımdaydı. Ancaq yenə nəsə çatmırdı, yenə mən özümü doğma kənddə qərib kimi, yad kimi hiss eləyirdim. Elə bil gözümün qabağındakı kəndimizin, dağlarımızın özü deyildi, surətiydi, şəkliydi – kəndin, dağların xatirəsiydi...

Və elə onda anladım ki, çatışmayan adamlardı, tanış, doğma üzlərdi, səslərdi. Gözümlə gördüm, canımla-qanımla duydum ki, vətən ilk növbədə vətəndə yaşayan insanlardı, vətən adamlarla canlıdı. O adamlar hansı tor-

pağa-daşa, hansı ağaca-kola, hansı dağa-dərəyə, çaya-bulağa, hansı ata-itə, quşa öz dilini öyrədib ruhunu köçürsə, vətən oradadı.

...İndi Laçın böyüyüb Azərbaycan boyda olub. Mənim kəndlilərim neçə-neçə bölgəyə dağılıb. Hərdən onların arasında oluram. Ancaq doğma üzlər içində özümü yenə də qəriblikdəki kimi hiss eləyirəm; onlarsız kənddə necəydisə, eləcə. Çünki vətən təkcə doğma üzlər, doğma səslər demək deyil. Vətən insandan başlayır, ancaq insanda qurtarmır. O insanın keçmişi, taleyi, yaddaşıyla bağlı nə varsa, hamısını toplayanda cəmi VƏTƏN eləyir. Vətənim adamın mindiyi at da vətəndi, o atın gəzdiyi dağlar da vətəndi, o dağlara yağan yağış, o yağışı gətirən bulud, o buludu saxlayan göy, o göydə süzən quş, o quşun qonduğu budaq da vətəndi. Əgər bu halqalardan biri qırılıb düşübsə, deməli, vətən zədəlidi, yarımçıqdı, şikəstdi. Laçınlıların yaşamadığı Laçın kimi. Və yaşadığı yerdə Laçın qura bilməyən laçınlılar kimi...

***May, 2001-ci il, "Avropa" qəzeti***

**<u>MƏKTƏBLƏRİMİZ</u>**

## MİŞNİ MƏKTƏBİ

Mişni kəndində ilk məktəb 1928-ci ildə təşkil edilmişdir. İlk müəllimləri Mişni kənd sakinləri Qarakişi Heydərov və Süleyman Fətəliyev olmuşdur. Bir neçə xarici dil bilən Qarakişi müəllimə (həmin dövrdə ucqar kənddə çox az rast gəlinən hal idi) və Süleyman müəllimə bu işdə əsas dəstəyi Hərbi Yunkerlər Məktəbinin məzunu, kənd ziyalısı Abdulla Mirzə oğlu Nəbiyev vermişdir. Məktəbin ilk şagirdləri Mişni kəndindən Bəhram Həsənov, Çərkəz, Əsəd oğlu Həmzə, Museyib İbrahimov, Rəhman Məmmədov, Həsən Hüsiyev, Alxaslı kəndindən Ağalar, Gülmalı, Seyidlər kəndindən Xəlil və s. olmuşdur. Məktəbdə ilk dərslər Nəcəflərin bir gözdən ibarət dəhlizsiz otağında keçilmişdir. Oturacaqlar divarın dibi ilə düzülmüş ağac tirlər olmuşdur. Yazı dizin üstündə yazılmışdır. Yazı taxtasını tüstüdən his basmış divarlar, təbaşiri kəndin ətrafından xam şəkildə çıxarılan əhəngə oxşar material əvəz etmişdir. Bu xam material ocaqda bişirildikdən sonra hazır vəziyyətə gətirilərək istifadə olunurdu. Qışda sinif otağının ortasında orta ocaq yandırılmış, sonradan peç qurularaq "istilik sistemi" təmin edilmişdir. Sonrakı illərdə şagirdlərin sayı artdıqca təbiətin möcüzəsi olan mağaralardan da sinif otaqları kimi istifadə edilmişdir.

Dəftər iki formada düz cızıqlı və hüsnxət, karandaş üç növ – kimyəvi, bənövşəyi və yaşıl olmuşdur. Sənədin əslini yazarkən bənövşəyi rəngdən istifadə olunurdu ki, saxtakarlıq olmasın (bənövşəyi rənglə yazılmış yazını

silmək olmurdu). Dəftərə yazı karandaş və mürəkkəbə batırılan pero ilə yazılmışdır. Karandaşı cibdə saxlamaq üçün sancağı, ucunu qorumaq üçünsə ucluğu olurdu. Kimyəvi karandaşdan istifadə edərkən uşaqlar dillərini tez-tez karandaşın ucuna vurduqlarından Qarakişi müəllim şagirdləri xəbərdarlıq edərdi ki, sağlamlıqlarına ziyan gəlməsin. Hökumət davamlı olaraq yoxsul və yetim uşaqlara paltar və ayaqqabı yardımı göstərmişdir. Dərslər akademik dərs saatı olaraq 45 dəqiqə təşkil etmişdir. Məktəbdə keçilən ilk dərslər ana dili, təbiət və riyaziyyat fənləri olmuşdur. Zəng olaraq Qarakişi müəllim dərsə çağırış kimi "Sinfə", dərsin qurtardığını elan etmək üçün isə "Tənəffüs" deyərək səslənərdi.

Tədris edilən maraqlı dərslərdən biri Qarakişi müəllimin "tənəzzöh" adlanan ekskursiya dərsləri olub. Təbiət hadisələrini şüurlu şəkildə başa düşmək üçün bu dərslərin əvəzsiz rolu olub. Hətta riyaziyyat dərslərində hesablama məsələlərini daha dərindən mənimsəmək üçün Qarakişi müəllim şagirdləri 1,5 km uzaqlıqda olan dəyirmana aparmaqdan belə çəkinməyib.

1929-cu ildə yenidən bir sinif olmaqla məktəb fəaliyyətini davam etdirmiş, əvvəlki uşaqlara yeniləri əlavə olunmaqla birinci sinif yenidən təşkil olunmuşdur. Yeni şagirdlər Mişni kəndindən Süleyman oğlu İmran, Lazım oğlu Gəray, Əhməd oğlu Əhəd, Nadir qızı Ayna, Həsrət, Abuhəyat, Maral, İmran qızı Mələk, Zöhrə, Göyüş Rzayev, Mayıs kəndindən Teymur (valideynlərini balacaykən itirib), Rza, Abduləli olmuşdur. Məktəbin müdiri Qarakişi Heydərov olmuşdur.

1930-cu ildən başlayaraq birinci və ikinci siniflər açılmışdır. Məktəbin müdiri Şuşadan Zahid Orucov təyin edilmişdir. Alxaslı kəndindən İlyas İlyasov, Laçın rayonunun başqa kəndlərindən Balakişi müəllim və Mahmud müəllim məktəbdə müəllimlik fəaliyyətinə başlamışlar. Sonrakı illərdə siniflərin sayı artırılaraq məktəb 7 illik səviyyədə fəaliyyətini davam etdirmişdir.

1937-ci ildə daşla hörülmüş 7-8 otaq və böyük dəhlizdən ibarət ilk məktəbin tikintisinin əsası qoyulmuş, lakin İkinci Dünya müharibəsinin başlanması ilə yarımçıq qalmış, müharibə qurtardıqdan bir neçə il sonra yekunlaşdırılaraq şagird və müəllim kollektivinin istifadəsinə verilmişdir. 1941-1945-ci illər müharibəsinin acıları digər sahələrdə olduğu kimi, məktəbə də öz təsirini göstərmişdir. O illərdə direktor Bəhram Həsənovla birlikdə bütün müəllimlər böyük fədakarlıq göstərmiş, arxa cəbhədə yaşanan maddi və mənəvi çətinliklərin dəf olunmasında əhaliyə dayaq olmuşlar. Müharibəyə xas olan kütləvi yoxsulluq insanların varlığı üçün çox təhlükəli həddə çatmışdı. Öz başçısını itirmiş ailələrdə vəziyyət daha acınacaqlı olmuş, uşaq əməyindən maksimum istifadə özünü belə ailələrdə daha qabarıq göstərmişdir. Lakin müharibənin dəhşətli izlərini özündə daşıyan dövlət həmin illərdə

təhsilə qayğını diqqət mərkəzində saxlamışdır. Belə ki, 1941-1945-ci illərdə kolxozda üç fond – Bölünməz fond, Əlillər fondu və İstinahar fondu yaradılmışdı. Kolxoz məktəb üçün 3 hektar ayırmışdı ki, təsərrüfat hesabı ilə buğda əkilsin. Yaz buğdası səpilirdi, çinlə biçilib, xırmanda döyülüb dəyirmanda üyüdülürdü. Təsərrüfat hesabı və yalnız məktəb üçün ayrılmış İstinahar fondu vasitəsilə müharibə aclığından qismən qurtulmaq üçün şagirdlərə günorta "istinahar" bişirilib paylanmış, şagirdlər evlərindən bir qab və bir qaşıq gətirməklə əsasən umac və yarma yeməkləri ilə qidalanmışlar. Şagirdlər müharibəyə, çətinliyə baxmayaraq, dərsdən qala bilməzdilər. Şagird dərsə gəlməyəndə kənd soveti başçısına xəbər verilərdi, o da şagirdin evinə gedib cəza olaraq həmin evin su qabını aparıb idarəyə qoyardı və bir neçə gün onu sahibinə qaytarmazdı. Ev sahibi bulaqdan su daşınması işində çətinlik olmasın deyə çalışardı ki, uşağı dərsdən yayınmasın. Gündüzlər məktəb yaşlı uşaqlara dərs deyən müəllimlər axşamlar savad kursları təşkil etmiş, burada yaşı ötmüş uşaqlara və böyüklərə yazıb-oxumağı öyrətmişlər. Bu kurslarda keçilən dərslər "məccani" dərslər adlanıb. Müəllimlər bu kurslarda məvacib almadan çalışıblar və bu dərslər müharibə dövründə müəllimlərin dövlətə kömək məqsədi ilə verdikləri töhfə olub.

"Məccani" dərslər fermalarda da təşkil olunmuşdur. Əli Səlim oğlu Həsənov hər axşam Ərtəpənin qoynunda yerləşən fermada qadınları toplamış, yazı taxtası quraraq gah çıraq, gah da ocaq işığına onlara dərs keçmişdir. Lakin müharibə fədakarlıqla keçirilən belə işləri yarımçıq qoymuşdur. Məktəbdə çalışan kişi müəllimlər müharibəyə göndərilmişlər. Müharibənin xofu, dəhşətli aclıq, səfalət məktəbə və təhsilə də öz mənfi təsirini göstərmişdir.

1944-cü ildə dövlət tərəfindən müharibədə olan müəllimlər müharibə zonasından tərxis olundular ki, yerlərdə təhsilin səviyyəsi çox aşağı düşməsin. Müharibəyə gedən müəllimlərdən Bəhram müəllim, Ağca müəllim və Fətiş müəllim geri qayıtdılar. Məktəbdə bir canlanma yarandı.

Mişni məktəbinin fəaliyyətinin ən əlamətdar illəri 1965-1990-cı illərə təsadüf edir. Bu illərdə məktəbin direktoru işləmiş Vahid Məmmədov məktəbdə güclü maddi-texniki baza yaratmağa nail olmuş, həyatını məktəbə həsr edərək təhsil sahəsində böyük bir irs qoyub getmişdir.

1972-ci ildə Mişni 8 illik məktəbi orta məktəb statusu alaraq fəaliyyətə başladı. Yüksək səviyyədə savada malik müəllimlərlə yanaşı, güclü maddi-texniki bazanın əsasları da qurulmağa başladı. 1973-cü ildə məktəbdə emalatxana fəaliyyətə başladı. Emalatxanada tədrisə aid bütün əyani vəsaitlər və avadanlıqlar var idi. Rayon Təhsil Şöbəsi mütəmadi olaraq bu vəsait və avadanlıqların göndərilməsini təmin edirdi. Gözəl sənətkar Ziyad kişinin oğlu

Yurisin emalatxanada ustalıq bacarığı həm şagirdlərə, həm də məktəbə böyük fayda verdi.

1970-ci ildə məktəbdə kitabxana, 1972-ci ildə laboratoriya fəaliyyətə başladı. Müxtəlif fənn kabinələri yaradıldı. Bu kabinələr lazımi dərs avadanlıqları ilə təmin edildi. Dərslərin fənn kabinələrində laboratoriya avadanlıqlarının müşayiəti ilə keçirilməsi şagirdlərin bilik səviyyəsinin yüksəlməsi üçün zəmin yaradan əsas səbəblərdən biri oldu.

Məktəbdə mütəmadi olaraq təcrübəli müəllimlərin açıq dərsləri keçirilirdi. Gənc müəllimlər bu üsuldan istifadə edərək pedaqoji və metodiki biliklərə yiyələnirdilər. Məktəbdə pedaqoji kollektivin hər bir üzvünün nöqsanı pedaqoji şurada qərəzsiz müzakirə edilirdi. Məktəbdə işin müvəffəqiyyəti yüksək səviyyədə idarəçiliyin və pedaqoji kollektivin birgə işinin nəticəsi idi. Bu müvəffəqiyyətin səmərəsi idi ki, hər il məktəbdən ən azı 7-8 nəfər ali məktəblərə qəbul olunurdu. Ən təqdirəlayiq hal o idi ki, ali məktəblərə yalnız öz bilik səviyyəsinə güvənən şagirdlər üz tuturdu, valideynlərin iradəsi ilə təhrik edilən zəif bilikli şagirdlər yox. Bu işin nəticəsi olaraq, 1984-cü ildə məktəbin direktoru Vahid Məmmədova qabaqcıl maarif xadimi, tədris işləri üzrə direktor müavini Ramazan Qarayevə isə metodist müəllim adı verildi.

Müəllimlərin dərsə hazırlığı çox yüksək səviyyədə idi. Tədris işləri üzrə direktor müavini həftədə 24 saat dərs dinləyir və bu dərsləri müəllimlərlə birlikdə təhlil edərdilər. Bu, müəllimlərin işə münasibətini və məsuliyyətini artırırdı. Tələbkarlıq çox olduğundan, dərs bölgüsündə müəllimlər çox dərs götürmək istəmirdilər. Bunlar dərsin keyfiyyətinin yüksəlməsinə çox kömək edirdi. Məktəbin valideynlərlə sıx əlaqəsi var idi. Dövlət məktəb şagirdləri üçün Təhsil Fondu ayırırdı. İldə bir dəfə məktəbdə oxuyan uşaqların hər ailədən bir nəfərinə müxtəlif paltarlar alınıb verilirdi. Burada uşaqlar arasında fərq qoyulmadığına görə valideynlər məktəbdən çox razı idilər.

1975-ci ildə kəndin köçəri olaraq fermalarda yaşayan əhalisinin uşaqlarının normal təhsil almaları üçün məktəbin ikinci binası istifadəyə verildi. Belə şagirdlərin tədris ili boyu məktəbdə qalıb yaşamaları üçün otaqlar lazımi avadanlıqlarla təmin edildi. Dövlətin qayğısı ilə məktəbdə yeməkxana təşkil edildi və uşaqlar qidalılığı yüksək olan müxtəlif növ ərzaqlarla təmin edildilər. Aşpaz Maral xanımın mətbəx bacarığı, mədəniyyəti və ana qayğısı uşaqlarda xoş xatirələrlə silinməyən izlər qoydu. Məktəb yataqxanasında qalan uşaqların dərsdən kənar təlim və tərbiyəsi ilə məşğul olmaq üçün hər il məktəbin müəllimlərindən 3-4 nəfər "tərbiyəçi" ştatı üzrə ayrılırdı. Tərbiyəçi müəllimlər şagirdlərin dərsə hazırlığı və tərbiyələri ilə ciddi məşğul olur, onların istirahəti, qidalanmasına ciddi nəzarət edirdilər.

1976-cı ildə məktəb muzeyinin təşkili rayonda və respublikada bu məktəbə marağı bir daha artırdı. Məktəbin müəllimi və Pioner Baş Dəstə rəhbəri Qətibə Abdullayeva öz təşəbbüsü ilə illər boyu yığıb topladığı eksponatları ilə rayonda ilk məktəb muzeyinin əsasını qoydu. Kənd əhalisi özlərinə yaşayış evləri tikmək üçün torpağın altından daş topladıqca, yollar çəkildikcə, ərazilər əkin üçün şumlandıqca qədimliyə məxsus tapıntılar üzə çıxırdı. Laçın torpağının hər qarışı isə Azərbaycana məxsus qədimliyini özündə saxlayan izlərlə zəngindir. Bu tarixin izlərini qoruyub saxlamaq üçün Qətibə müəllimə fədakarlıq göstərdi, bu tarixi əşyaları toplamaq üçün əhaliyə müraciət etdi, uşaqları maarifləndirdi ki, tapılan əşyaları yığıb ona versinlər. Kənd əhalisi nəinki Qətibə müəlliməyə səs verdi, üstəlik nənə-babalarının toxuduğu və düzəltdikləri əşyaları da muzey üçün verdilər. Muzeydə əsasən daş dövrünə aid daş muncuqlar, daşlaşmış sümüklər, ağaclar, balıqqulağı və daşlaşmış saxsı qablar, okean və ya dənizə aid canlılara məxsus tapıntılar, iki minə yaxın muncuq, min beş yüzə yaxın bəzək əşyası, döyüşlərdə iştirak etmiş cəngavərlərə aid əşyalar saxlanırdı. Tez-tez Bakı şəhərindən müraciətlər olurdu, muzey əşyalarından sərgilər üçün eksponatlar seçilib Bakı şəhərinə göndərilirdi, sərgidə nümayiş olunduqdan sonra muzeyə qaytarılırdı. Tarixçi alimlərdən Qətibə müəllimə ilə məktub vasitəsilə əlaqə saxlayanlar var idi. Qətibə müəllimə şagirdlərlə apardığı təşkilati işlər və fədakarlığına görə metodist müəllim adı verildi.

Məktəbdə vətənpərvərlik mövzusu ən ümdə məsələlərdən biri idi. Vətəndaş olmaq, özünü vətənin bir parçası bilmək, vətəndaşlıq borcuna sahib çıxmaq kimi dəyərlər həmişə məktəbin diqqət mərkəzində olmuş, şagirdlərin bu ruhda tərbiyə olunmaları üçün müəllimlər əllərindən gələni etmişlər. Buna nümunə olaraq hərbi hazırlıq dərslərinin lazımi qaydada keçirilməsi, fənn kabinəsinin tədris üçün nəzərdə tutulmuş silah-sursatla təmin olunması, döyüşə hazırlıq üçün təlimlərin təbiət qoynunda keçirilməsini misal gətirmək olar. Meşələrdə o dövrdəki şagirdlərin hələ də yadından çıxmayan “Üfüqdə parıltı“ adlı partizan oyunlarının keçirilməsində gənc müəllimlər və şagirdlər böyük şövq ilə iştirak edərdilər.

Məktəbdə hərbi guşə təşkil edilmişdi. 1941-1945-ci il Böyük Vətən müharibəsi iştirakçılarının şərəfinə düzəldilmiş memorial lövhə və sərgi kompleksi məktəb şagidlərinin and yeri idi. Bu kompleksin təşkil olunmasında kəndin usta sənətkarı Ziyad Abbasovun xüsusi əməyi olmuşdur. Xüsusi ustalıqla xalis misdən kəsilib düzəldilmiş hərflər müharibə iştirakçılarının adlarını tarixə əbədi olaraq həkk etmişdi. Bu lövhə Azərbaycana məxsus naxışlarla bəzədilmişdi. Məktəbdə şagirdlərin sağlamlığına rəvac verən idman dərslərinin keçirilməsinə xüsusi diqqət yetirilmişdir. Çox səfalı

mənzərəsi olan idman meydançası, lazımi idman alətləri və avadanlıqlarının olması, havası, suyu təmiz olan təbiətlə ünsiyyət, idman dərslərinə xüsusi diqqət şagirdlərin sağlamlığı üçün zəmin yaradırdı. Bu sahəyə maraq o qədər güclü idi ki, hətta başqa kəndlərin şagirdləri ilə tez-tez idman yarışları təşkil olunurdu, qalib komandalar mükafatlandırılırdı. Şahmat, dama, voleybol, futbol yarışları xüsusilə maraq doğururdu. Şagirdlərimiz nəinki rayon turlarında, hətta respublika turlarında da iştirak edirdilər.

Çox maraqlı işlərdən biri aşağı səviyyədə oxuyan şagirdlərə təsir vasitələrindən istifadə qaydaları idi. Belə ki, məktəbdə "İynə" adlanan divar qəzeti tərtib edilmişdi. Dərsdən "2" qiyməti alan şagirdlərin karikaturaları Qətibə müəllim tərəfindən çəkilərək divar qəzetinə "vurulurdu". Divar qəzetinə baxan şagirdlər "2" qiyməti alan şagirdi şəkildən tanıdığından hər bir şagird çalışırdı ki, yaxşı oxusun və divar qəzetində utandırıcı şəkli çıxmasın.

Ən maraq kəsb edən işlərdən biri müəllimlər otağında veteran müəllimlərin gənc müəllimlərlə söhbətləri və onların təhsilin səviyyəsini yüksəltmək üçün verdikləri tövsiyələr idi. Bu söhbətlər həm də gənc müəllimlərin dünyagörüşünün formalaşmasında müstəsna rol oynayırdı. Vahid müəllimin, Ağca müəllimin, Bəhram müəllimin, Fətiş müəllimin, Surxay müəllimin (Mayıs kəndindən idi), Ramazan müəllimin, Cavad müəllimin, Nurəli müəllimin, Qənbər müəllimin, Misir müəllimin, Güllü müəllimənin, Piyalə müəllimənin və Güleyşə müəllimənin maraqlı söhbətlərini dinləmək gənc müəllimlər üçün böyük şərəf idi.

Müəllim kollektivi və şagirdlərin istirahətini təşkil etmək üçün məktəbdə çayxana tipli bufet fəaliyyət göstərirdi. Bufetdə satılan ərzaqlar daim müdiriyyət tərəfindən nəzarətdə saxlanılırdı ki, şagirdlərin sağlamlığına zərər verməsin. Məktəbin həyətində təsərrüfat hesablı bağ və bostan bitkilərindən alınan məhsul internatda qalan uşaqların ərzaqla təmin olunmasında mühüm rol oynayırdı. Məhsulun bir hissəsi isə məktəb kollektivi və kənd icma üzvlərinə satılaraq əldə olunan qazanc təhsilə və məktəbin mədəni-kütləvi tədbirlərinə sərf olunurdu. Kəndin rabitə sistemi ilə tam təmin olunması müəllimlərin valideynlərlə vaxtaşırı ünsiyyətini təmin edirdi. Poçt sistemi isə imkan verirdi ki, müəllimlər və şagirdlər sifariş yolu ilə hər ay dərsdənkənar lazımi kitab və jurnalları əldə etsinlər. Bu isə biliyin və dünyagörüşün formalaşmasına nəinki böyük təsir edirdi, həm də müasirliklə tanışlığı təmin edirdi.

Mişni kənd orta məktəbi 1992-ci ilə qədər gələcəyə inamla addımlayan bir elm ocağı idi. Erməni təcavüzü nəticəsində başlanan Qarabağ müharibəsi Mişni kənd orta məktəbinin doğma Laçında fəaliyyətinə də son qoydu. Rayon əhalisi kimi məktəb və kollektivi də köçkün həyatı yaşamağa məcbur

edildi. Məktəbdə yaşanan həyatın ən duyğulu və unudulmayacaq axırıncı günü isə 10 may 1992-ci il olacaqdı... Çox ağır məcburi köçkünlük həyatı yaşayacaq məktəb kollektivinin sözlə ifadə olunmayan vidalaşdığı anlar... Bu vida anlarını yaşayan fədakar müəllimlərin adlarını yada salmamaq mümkün deyil: Vahid Məmmədov (coğrafiya), Ağca Mirzəyev (dil-ədəbiyyat), Ramazan Qarayev (sinif məllimi), Cavad Heydərov (fizika), Nurəli Orucov (sinif müəllimi) , Qənbər Aslanov (kimya-biologiya), Misir Qarayev (rus dili), Tahir Nəcəfov (hərbi hazırlıq), Azad Heydərov (tarix), Güllü Heydərova (sinif müəllimi), Piyalə Nəcəfova (sinif müəllimi), Güleyşə Fərzəliyeva (sinif müəllimi), Töhfə Verdiyeva (riyaziyyat), Mərziyyə Abbasova (dil-ədəbiyyat), Varaşil İbrahimov (bədən tərbiyəsi,1991-1992-ci illər gənc kadr olaraq məktəbin direktoru olmuşdur), Zemfira Mirzəyeva (fizika), Venera Mirzəyeva (riyaziyyat və informatika), Xalidə İsmayılova (coğrafiya), Flora Məmmədova (coğrafiya), Rima İsayeva (riyaziyyat), Güllər Yusifova (musiqi).



Həyat davam edir – həyatla yaşanan adlarla və əbədiyyətə qovuşan adlarla...

**Venera MİRZƏYEVA,**
***Mişni kənd sakini,***
***Laçın rayon 7 №li tam orta məktəbin***
***riyaziyyat və informatika müəllimi***

**ANIM**

## LAÇIN RAYONUNUN İŞĞALINDAN İYİRMİ İKİ İL KEÇİR

Laçın rayonunun işğalından düz iyirmi iki il keçir. Düz iyirmi iki il bundan əvvəl 1992-ci ilin may ayının səkkizində Laçın rayonunda insanlar şən, xoşbəxt, firavan yaşayırdılar. Heç onların ağlına belə gəlməzdi ki, nə vaxtsa onlar bu gözəl, isti yurd-yuvalarından didərgin düşüb, Azərbaycanın bir çox rayonlarına səpələnələr. Onların da qismətinə məcburi köçkünlük yazısı yazıla və bu ağrı-acı ilə düz iyirmi iki il öz vətənlərində vətənsiz yaşayalar.

Laçın rayonu Ermənistanın Gorus və Dığ rayonları ilə qonşu idi. Laçın rayonu dağlıq ərazidə yerləşdiyi üçün Gorus və Dığ rayonları ilə demək olar ki, üz-üzə yerləşirdi.

...Axşam yavaş-yavaş düşməyə başlayırdı. Ayın səkkizinin gecəsi gördük ki, Gorus rayonunun ərazisində çoxlu tanklar, qradlar, BTR-lər, bir-birinin ardınca düzülərək – kalon halında bizim rayona doğru hücuma keçirdilər. Gecə olduğu üçün yanan bütün işıqlar daha açıq-aydın seçilirdi. Səkkizindən doqquzuna keçən gecə məhəlləmizə bir təcili yardım maşını gələrək, camaatdan kimin evində nə qədər varsa pambıq və ağ parça istədilər. Səbəbini soruşduqda dedilər ki, Şuşadan çoxlu meyit gətiriblər, aparırıq onları dəfin-kəfin edib, basdıraq. Kimin evində nə qədər pambıq-ağ var idisə hamısını verdilər.

Gecədən xeyli keçmiş bir kamaz gəlib atamı hara isə apardı. Nəzərinizə çatdırım ki, qardaşlarım İlham və Mehman həmin vaxt Laçın rayonunda Milli Ordunun çavuşu kimi döyüşürdülər. Atam Rəfailin səssiz-səmirsiz evdən getməsi anamı bərk təşvişə saldı; o, səhərə kimi yatmayaraq evin içində var-gəl etdi, demək olar ki, hamımızın yuxusu qaçmışdı. Həmin gecəni səhərə kimi bizim evdə heç kim yatmadı.

Ayın doqquzu səhər saat səkkiz-doqquz radələrində rayonda güclü atışma başladı. Gorus və Dığdan atılan güllələrlə demək olar ki, rayonun ən əsas yerlərini vururdular. Ən birinci vurulan yerlərdən biri rayon xəstəxanası, polis idarəsi, Laçın Rayon İcra Hakimiyyəti (o vaxtı icra hakimiyyəti raykom adlandırılırdı), şəhərin baş tərəfində yerləşən poçt şöbəsi və bazar oldu.

Bir azdan rayon tərəfdən çığırışma, insanların ah-naləsi ətrafa yayıldı. Biz Laçın rayonundan bir az aralı Kəlbəcər rayonuna gedən tərəfdə yaşayırdıq. Evimiz Qarıkahasına gedən yolda, Səməd Vurğun küçəsi ev 64-də idi. Rayondan gələn atışmanı eşidən anam Validə həyəcan keçirərək, İlhamla Mehmanın başında nə isə olduğunu deyərək ağlamağa başladı və dedi ki, gecə atanızı səssiz apardılar, yüz faiz qardaşlarınızın başında nə isə var. Bütün qonşularımız hazırlaşıb rayondan çıxmağa başladılar, ancaq, əmilərim gəlib bizi anamdan istəsə də o, bizi vermədi. Dedi ki, nə qədər ki, ataları, qardaşları gəlməyib biz heç yerə getməyəcəyik. Əlacsız qalan əmilərim öz ailə üzvlərini Kəlbəcər yolu ilə Bakıya yola saldılar.

Bundan sonra atamın RTS məhəlləsində yaşayan, qardaş qədər yaxın olan dostu Sovet dayı da gəldi ki, ver qızları aparım, ancaq anam bizim getməyimizə razı olmadı. Anam Sovet dayıdan da atamı xəbər aldı. Onun da atamdan xəbəri yox idi. Beləliklə, biz rayonda oturub atam və qardaşlarımızın yolunu gözləməyə başladıq. Bir azdan daha şiddətli atışma başladı, evlərində qalan qonşularımız, çay aşağı Hoçaz kəndinə tərəf qaçmağa başladılar. Axırda anama dedilər ki, burada təkcə qalıb nə edəcəksən, qızlarını ermənilərə əsir vermək istəyirsən, tez gəl bizimlə gedək. Qeyd edim ki, o vaxt Xocalı rayonu yenicə işğal olunduğuna görə, orada ermənilərin insan-

ların başına açdıqları vəhşi hərəkətlər insanların gözlərini qorxutmuşdu. Odur ki, anam bunları gözünün qarşısına gətirərək getməyimizə razılıq verdi. Ancaq biz Bakıya tərəf deyil Hoçaz kəndinə tərəf gedəsi olduq. Çayın yanında bir "ZİL" dayandı; biz hamımız o maşına minərək Hoçaz kəndinə getdik. Orada bizi qarşılayan insanların ah-naləsi, onların bizə qoşularaq ağlaşması heç zaman xatirimdən çıxmayacaq. Sanki elə bil yer ilə göy qovuşmuşdu, hətta, kənddə yaşayan bütün heyvanlar da hamısı birdən mələşirdi.

Nə isə, həmin gecəni orada səhərə kimi dirigözlü açdıq, çünki, heç burada da atışmanın səsi kəsmirdi. Bir haşiyə də çıxım ki, Hoçaz kəndi rəhmətlik Rövşən Cavadovun kəndi idi. Allah ona da rəhmət eləsin!

Səhər tezdən gəldiyimiz maşınla rayona qayıdırdıq ki, yolda rəhmətlik atam qarşımıza çıxdı. O, bizi "ZİL"dən düşürüb özünün gəldiyi "Volqa"ya mindirdi. Atamın sağ-salamat gəldiyini görən anam xeyli toxtadı və atama gecə niyə səssiz-səmirsiz getdiyini sual verdikdə o, dedi:

– Gecə məni avtobazanın müdiri çağırmışdı. O, dedi ki, rayonda vəziyyət olduqca ağırdır, odur ki, mən öz ailə-uşağımı səndən başqa heç kimə etibar edə bilmərəm. Apar mənim ailəmi Bakıya qoy qayıt, sonra isə öz ailə-uşaqlarını apararsan. Bütün gecəni yol gedib qayıtmışam, gələndə isə sizi evdə tapmadım. Anam isə bizim başımıza gələnləri bir-bir atama danışdı. Qardaşlarımdan nə isə bir xəbər olub-olmadığını soruşdu. Atam isə cavabında dedi:

– Qorxma onlara heç nə olmaz, çünki bütün rayon silah-sursatla doludur.

Biz rayona gələrək evdən müvəqqəti yaşamaq üçün əyin-baş və ərzaq götürdük. Bakıya gələrkən yol boyu qarşımıza çoxlu avtobuslar çıxırdılar, onlar hamısı rayon əhalisini oradan çıxartmağa gedirdi. Mən hələ də özümdə bu suala cavab axtarıram, axı onlar nə üçün rayonu boşaldırdılar. Ermənilərə hazır təhvil verməyəmi? Axı Laçın rayonunda olan o qədər silahlarla nəinki Laçını, hətta, bir çox rayonları da qorumaq olardı. Laçın xəyanətin qurbanı oldu!

*Qurban olum torpağına-daşına,*
*Qaldır məni Kırs dağının başına,*
*Qoy dolanım Laçın sənin başına,*
*Deməsinlər pərvanəsi çatışmır.*

Atam Rəfail on səkkiz il yurd həsrəti ilə yaşadı, ölən günə kimi dedi ki, sizi Laçından bu maşın ilə çıxartmışam, bu maşın ilə də sizi Laçına qaytaracağam. Bu on səkkiz ildə Laçın rayonu onun bir gün yadından çıxmadı, evə nə

alırdısa deyirdi ki, inşallah rayonda işlədərik. Ancaq, çox təəssüf ki, bu günü görmək atama qismət olmadı, o, elə Laçın deyə-deyə bu dünyadan köçdü:

Laçın həsrətilə yaşayırdı o,
Ümidlə gözlərdi hər an o günü,
Deyirdi bu sarı maşınla sizi,
Gün gələr Laçına apararam mən.



Allahdan arzum odur ki, torpaqlarımız geri alınsın, atamın həsrətində olduğu yurdumuza anamla birgə qayıda bilək.

**Məlahət AĞAYEVA,**
***sənətşünaslıq üzrə fəlsəfə doktoru***

## LAÇIN TOPONİMLƏRİ

### BULAQLAR

**Ağanus** *hidr., mür.* Laçın rayonu ərazisində mineral bulaq. Hidronim *ağan/aqan* (iti axan) və *us* (su) sözlərindən düzəlib, "iti axan su" deməkdir.

**Ağbatxayır** *hidr., mür.* Laçın rayonu ərazisində mineral bulaq. Ağbatxeyir (Minkənd çayının qolu) çayının dərəsindədir. Suyu az kükürdlüdür; xalq bu sudan mədə ağrısının müalicəsində istifadə edirdi. Yerli əhalinin məlumatına görə, təhrifə uğramış bu hidronimin əsli Aqibəti xeyirdir. Bulağın belə adlandırılması suyunun müalicəvi faydası ilə izah olunur. Hidronim *ağ* (rəng), *bat/bad/bed* (kənd, məskən, hündur yer) və *xayır/ kayır* (su şırnağı, fəvvarə) sözlərindən düzəlib, "Ağkənd bulağı" deməkdir. Tarixi mənbələrdə verilən məlumata görə, orta əsrlərdə Dağlıq Qarabağda Aqbat/Aqbed adlı, yaşayış məntəqəsi olmuşdur. XIX əsrin 20-ci illərində həmin kəndə ermənilər doluşmuş və onun adını çevirərək Spitakşen, yəni Ağkənd qoymuşlar.

**Çilgəz** *hidr, sadə.* Laçın rayonu ərazisində, *Çilgəz* dağının ətəyində mineral bulaqdı. Adını eyniadlı dağdan almışdır.

**Əhmədli** *hidr., sadə.* 1. Laçın rayonunun Əhmədli kəndi yaxınlığında mineral bulaq. 1635-1655 m. hündürlükdə, çoxdebitli 7 bulaqdan ibarətdir; 2. Laçın rayonunda çay. Orta axarında Ağoğlan və ya Minkənd, aşağı axarında isə Zabux adlanır. Etnotoponimdir.

**İlxısu** *hidr., mür.* Laçın rayonu ərazisində Minkənd mineral bulaqlarının digər adıdır. Tədqiqatçılar bu hidronimi İlıqsu adının təhrif olunmuş forması hesab edirlər.

## ÇAYLAR

**Ağoğlan** *hidr., sadə.* Həkəri (Əkərə) çayının sağ qolu olub Laçın rayonunun ərazisindən axır. Yuxarı axarında Minkənd və ya Əhmədli, aşağı axarında isə Zabux adlanır. Adını ərazidəki eyniadlı dağdan almışdır.

**Ağsu** *hid., mür.* Laçın rayonunda çay. Həkəri (Əkərə) çayının sağ qoludur. Qarabağ silsiləsindən başlanır.

**Axarsu** *hidr., mür.* Laçın rayonu ərazisində çay. "Axan su, çay" mənasında olan hidronim suyun hərəkəti ilə bağlı yaranmışdır.

**Aralıqbulaq** *hidr., mür.* Laçın rayonu ərazisində bulaq və çay. Hidronim Aralıq və bulaq sözlərindən ibarət olub, coğrafi obyektin yerləşmə mövqeyini bildirir. Çayın adı eyniadlı bulaqdan götürülmüşdür.

**Ardaşavasu (Ərdəşəvisu)** *hidr, mür.* Laçın rayonu ərazisində çay. Şəlvə çayının qoludur. Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır.

**Bayandur** *hidr., sadə.* Laçın rayonunda çay. Zabux çayının sağ qoludur. Suvarma üçün istifadə edilir. Hidronim oğuz tayfalarından birinin adını daşıyır. Etnotoponimdir. Bayandır variantında da işlənir.

**Bəzirgansu** *hidr., mür.* Laçın rayonunda çay. Həkəri çayının sol qoludur. Uzunluğu 9 km. Çay öz mənbəyini Bəzirgan aşırımından aldığı üçün belə adlandırılmışdır.

**Çəmənliçay** *hidr., mür.* Laçın rayonu ərazisində çay. Qozlu kəndinin cənubundan axaraq Şəlvə (Həkəri çayının qolu) çayına tökülür. Çay öz başlanğıcını Çəmənli adlı yerdən aldığı üçün belə adlanır. Bəzən İpəkçay da adlanır. Bu da Birinci İpək kəndinin yaxınlığından axdığı üçündür.

**Çıxmansu** *hidr, mür.* Laçın rayonu ərazisində çay. Şəlvə çayının sol qoludur. Hidronim *çıxman* (qalxan, pilləkən) və *su* komponentlərindən düzəlib, "qalxan su" mənasındadır.

**Fərraş** *hidr., sadə.* Laçın və Kəlbəcər rayonları ərazisində çay. Adını ərazisindən axdığı eyniadlı yaşayış məntəqəsindən almışdır.

**Həkəri** *hidr., sadə.* Laçın, Qubadlı və Zəngilan rayonları ərazisində çay. Arazın sol qoludur. Mənbəyini Mıxtökən silsiləsinin cənub-şərq yamaclarından (2580 m. yüksəklikdən) alır. Bərgüşad (Bazarçay) çayı ilə birləşərək Araza tökülür. Üzərində üç SES tikilmişdir. Yuxarı axarında Şəlvə (eyniadlı kəndin adından) adlanır. Keçmiş adı Alban (Ağvan) olmuşdur. IX-XII əsrlərə aid ərəb mənbələrində Arran-çay adlanır və Araza töküldüyü göstərilir. Əkərə də adlanır. Görünür, sonralar kürddilli *həkəri* tayfasının ətraf ərazidə məskunlaşması ilə əlaqədar tədricən həmin tayfanın adı ilə tanınmağa başlamışdır.

**Hoçazsu** *hidr., mür.* Laçın rayonu ərazisində çay. Həkəri çayının sağ qoludur. Yuxarı axınında İldırımsu, aşağı axınında Qaranlıqçay adlanır. Çay öz başlanğıcını Hoçaztəpə dağından alır. Hidronimin ərazidəki Qoşasu adının variantı olması ehtimal edilir.

**Xəznəvarsu** *hidr., mür.* Laçın rayonu ərazisində çay. Zabux çayının sağ qoludur. Əsl adı Xəzinəvarsudur. Hidronim *xəznə/xəzinə* (Azərbaycan dilinin dialektlərində "otla zəngin örüş", "otlaq"), *var* (kürd dilində "binə", "yurd", "köç", "düşərgə", "qışlaq") və *su* (burada "çay") sözlərindən düzəlib. Çay başlanğıcını otla zəngin olan yurd yerinin yaxınlığından aldığı üçün belə adlandırılmışdır.

**Xoşgədik** *hidr., sadə.* Laçın rayonu ərazisində çay. Həkəri çayının sol qoludur. Suvarma və dəyirmanları hərəkətə gətirmək üçün istifadə edilir. Çayın adı Xoşgədik dağının adından alınmışdır.

**İqondunax** *hidr., mür.* Laçın rayonu ərazisində çay. Hidronim ərazidəki Ağbulaqçay su hövzəsinin kürd dilinə tərcümə olunmuş adıdır.

**İldırımsu** *hidr., mür.* Laçın rayonu ərazisində çay. Hoçazsu çayının sağ qoludur. Dar dərələrdən axır. Başlanğıcını İldırım dağından aldığı üçün belə adlandırılmışdır.

**İnəkçay** *hidr., mür.* Laçın rayonu ərazisində çay. Çay öz başlanğıcını İnəkdağ zirvəsindən aldığı üçün belə adlandırılmışdır.

**Kürdhacı** *hidr., sadə.* Laçın rayonu ərazisində çay. Çay adını ərazisindən axdığı Kürdhacı kəndindən almışdır.

## GÖLLƏR

**Ağgöl** *hidr., mür.* Laçın rayonu ərazisində göl. Hidronim *ağ* (təmiz, şəffaf, içməyə yararlı) və *göl* (su obyekti) sözlərindən düzəlib, "şəffaf sulu göl" və ya "içməyə yararlı suyu olan göl" deməkdir. Şor sulu göllərdə isə sahillərinin ağ şoran sahə olması nəzərə alınır. Qarabağ və Mil düzlərində bu adlı bir neçə başqa göllər də vardır. Cənubi Azərbaycanda, Ermənistanda (Ağgöl), Qərbi Sibirdə (Akkul), Qazaxıstanda (Akkol), Tatarıstanda (Akul/Akqol/Beloozerka) və başqa türkdilli regionlarda da çox sayda Ağgöl hidronimləri qeydə alınmışdır.

**Coflugöl** *hidr., mür.* Laçın rayonu ərazisində göl. Hidronim *coflu* (otlu) və *göl* komponentlərindən düzəlib, "otlu (yosunlu) göl" mənasındadır.

**Mənbə: Azərbaycan toponimlərinin ensiklopedik lüğəti.**
***İki cilddə. I cild. Bakı, "Şərq-Qərb", 2007***

**Təqdim etdi: Araz YAQUBOĞLU**

**ANIM**

## ELŞADSIZ GÜNLƏR



Dünyada insan üçün müqəddəs, əziz çox şeylər var. Onların içərisində ən toxunulmazı, müqəddəsi, unudulmazı Vətəndir. Vətən bizim doğulduğumuz, boya-başa çatdığımız, yaşadığımız, nənə-babalarımızın dəfn olunduğu yerdən başlayır.

Artıq iyirmi iki ildir ki, igidlər, ərənlər məskəni olan, Sultan bəy kimi el qəhrəmanının at oynatdığı, ermənilərə meydan oxuduğu torpaqlarımıza, uca dağlarımıza, bərəkətli, bənövşəli, nərgizli, novruzgüllü yerlərimizə həsrət qalmışıq.

İllərdir ki, Laçınsız günlər ürəyimizi parçalayır, dağlayır. Amma gün gələcək, Azərbaycanın qorxmaz oğulları işğal altında olan torpaqları geri qaytaracaq.

"Laçın yurdu" jurnalının birinci nömrəsini (2014-cü ildə) əlimə alıb oxuyarkən orada Habil Muradovun məqaləsinə rast gəldim. Məqalədə Laçın polislərinin igidliklərindən bəhs olunurdu. Laçın polisində əvəzedilməz, heç bir çətinlikdən qorxmaz olanlardan biri də Elşad Qarayev idi. Laçın Polis Şöbəsinin rəisi Akif Səlimovun rəhbərliyi altında bütün polislər xüsusi qəhrəmanlıqlar göstərmişlər.

Qarayev Elşad Ramazan oğlu 1961-ci ildə Laçın rayonunun Mişni kəndində ziyalı ailəsində dünyaya gəlib. Orta məktəbi kənddə, Bakı Bədən Tərbiyəsi Texnikumunu Bakıda bitirib. Laçın rayon mərkəzindəki idman məktəbində müəllim işləyib.

Elşad Qarayevin ən böyük arzusu polis olmaq idi. Bu arzusu onu 1988-ci ildə Laçın Rayon Polis Şöbəsinə gətirir və serjant kimi fəaliyyətə başlayır. Laçın, Şuşa, Ağdam, Ağdərə uğrunda gedən döyüşlərdə fəal iştirak edir. Həmişə ən çətin tapşırıqları yerinə yetirib, təhlükəli postlara, kəşfiyyatlara göndərilib. Həmişə də döyüşlərdən alnıaçıq, üzüağ çıxıb.

3 aprel 1991-ci ildə Şuşa rayonu ərazisində vertolyot qəzasına düşüb, nəticədə topuq sümüyü çatlayıb, həm də çiynindən zədə alıb. Mərhum telejurnalist, istedadlı şair Alı Mustafayev, alim Aydın Məmmədov və bir sıra görkəmli adamlar da həmin vertolyotda olublar.

Elşad Qarayevin göstərdiyi qəhrəmanlıqların sayı-hesabı yoxdur. Onun göstərdiyi qəhrəmanlıq özünü ən çox Laçın rayonunun Hoçaz dağında gedən döyüşdə göstərmişdir.

Bu döyüşdə Laçın polisləri xüsusi qəhrəmanlıq nümayiş etdirirdilər. Sanki tale bu polisləri birləşdirmişdi. Oqtay Güləliyev, İsrafil Şahverdiyev və Elşad Qarayev. Onlar həm də yaxın dost idilər.

Elşad Qarayev Laçın polis batalyonunda rota komandiri, baş leytenant idi. Laçının Milli Qəhrəmanları, Elşad, bir dəstə polislə birlikdə 1992-ci il noyabrın 3-də daş karxanasını tutmuşdular.

Bir gün Elşad Qarayev 5 nəfər də götürüb kəşfiyyata gedir. O, hamıdan qabaqda gedirdi. Qarşılarına "UAZ–469" markalı erməni maşını çıxdı. Dərhal maşını avtomat atəşinə tutdu. Maşındakılar erməni ordusunun rütbəli şəxsləri idi. Onların beşini də güllələdi. Erməni podpolkovniki Nerjon Barsakoviç Xandzadyandan hərbi-kəşfiyyat xəritəsini götürmüşdü. Onlardan götürülmüş məxfi sənədlər Respublikanın Daxili İşlər Nazirliyinə göndərildi.



Füzuli cəbhəsində vuruşdu, bu bölgədəki Laçın polis batalyonunun rota komandiri, sonra Ağcabədinin Taxtakörpü qəsəbəsində sahə müvəkkili, 1997-ci ildən Laçın Rayon Polis Şöbəsindən Bakı Şəhər Baş Polis İdarəsinə, buradan da Qaradağ rayonuna ezam edilmişdir. Qaradağ rayonunun Sahil qəsəbəsində sahə müvəkkili işləyirdi. Öz vəzifəsinin öhdəsindən bacarıqla gəlirdi.

1999-cu il sentyabrın 27-də Dövlət Yol Polisi postundan evə qayıdarkən vaxtsız əcəl onu aramızdan apardı. Qarabağın od-alovundan, qızğın döyüşlərindən sağ çıxan döyüşçü Qaradağda faciəli surətdə həlak oldu.

O, torpaqlarımızı qorumaq, o yerlərə qayıtmaq arzusu ilə yaşayırdı. Onun arzularının gerçəkləşdiyi gün gələcək. Özü həyatda olmasa da, bu günü bütün azərbaycanlılar, onun övladları Elmir, Samir və nəvəsi Hüseyn görəcəkdir.

Laçın rayon 7 №-li tam orta məktəbinin dəhlizində Azərbaycanın Milli Qəhrəmanı İsrafil Şahverdiyev və onun döyüş yoldaşı, həmin məktəbdə idman müəllimi işləmiş Qarayev Elşad haqqında guşə hazırlanıb. Bu guşə dərs dediyim sinfin önündədir. Hər sinfə girəndə o şəkillərə baxmamış içəri keçmirəm. Bir bacı kimi mən onunla qürur duyuram. Heç vaxt təriflənməyi sevməzdi. Amma onun göstərdiyi şücaət misilsizdir.

Elşad Qarayevin bu xüsusiyyətlərə malik olması, Vətənə bağlılığı onun valideynlərinin tərbiyəsinin nəticəsi idi. Atası Ramazan müəllim, anası Qüdrət xanım Elşad kimi oğulla fəxr edirlər. Çünki Elşad tək onların deyil, Azərbaycan xalqının igid oğludur.

**Sayad QARAYEVA,**
***Laçın rayonunun Mişni kənd sakini,***
***Laçın rayon 7 №-li tam orta məktəbin ibtidai sinif müəllimi***

**MÜSAHİBƏ**

## “GƏRƏK VƏZİFƏDƏ İŞLƏYƏN ADAM ANLASIN Kİ, NƏ VAXTSA BU VƏZİFƏDƏN GEDƏCƏK”



***Müsahibimiz Laçın Rayon İcra Hakimiyyətinin başçısı, ehtiyatda olan polis polkovniki Akif Səlimovdur.***

**– Akif müəllim, ovqatınız necədir? Laçın Rayon İcra Hakimiyyətinin başçısı təyin edilməyinizin bir ili tamam olandan sonra sizdən müsahibə almaq qərarına gəldik.**

– Ovqat Laçın kökünün üstündədir. Laçın kökü isə spesifik kökdür. Təbii ki, Laçınsızlıq ovqatımıza təsirsiz ötüşmür. Amma gələcəyə nikbinliyimizi qoruyub saxlamağa çalışırıq. Yəni bu baxımdan ovqatım pis deyil, yaxşıdır.

**– Təcrübədən bilirik ki, oxucular üçün müsahibimizin bioqrafiyası çox maraqlıdır. Ona görə də yığcam tərcümeyi-halınızı öz dilinizdən eşitmək istərdik.**

– Mənə elə gəlir ki, laçınlıların böyük əksəriyyətinin tərcümeyi-halı bir-birinə oxşayır. Ona görə də bioqrafiyam digərlərindən o qədər də fərqlənmir. Atam müəllim olub. Qarıqışlaqda məktəbə getmişəm, orta məktəb qurtarmışam. Ali təhsil almaq məqsədilə Bakıya gələrək Politexnik İnstitutunu (indiki Azərbaycan Texniki Universiteti) bitirmişəm. O vaxt hər qrupdan 3-4 nəfər yaxşı oxuyan tələbəni təyinatla orduya zabit göndərirdilər. Mən də təyinatla Sovet Ordusu sıralarında zabit kimi hərbi xidmətə başladım. Tank polkunda kəşfiyyat rotasının komandiri oldum. Ordudan tərxis olunandan sonra Bakıda sement zavodunda, Laçında təmir-tikinti sahəsində, daş karxanasında, raykomda müxtəlif vəzifələrdə işlədim.

Sovet dönəmində partiyanın xətti ilə polis şöbəsinə siyasi hissə üzrə rəis müavini göndərdilər. Bu vəzifədə çalışmaq üçün hüquq-mühafizə orqanlarında müəyyən təcrübən olmalıydı. Hərbi rütbəm olduğuna görə bu prosesdən asan keçdim. Beləliklə, kapitan rütbəsində gəldim polisə. Bir neçə il işlədim və baxdım ki, həyatımı artıq polislə bağlamışam. Qiyabi yolla Volqaqrad Ali İstintaq Məktəbində ikinci ali təhsil aldım. 1990-cı ilin sonuna yaxın özümün xəbərim olmadan rəhmətlik general Məhəmməd Əsədov məni Laçın Rayon Polis Şöbəsinə rəis təyin etdi. O vaxtdan başlayan rəislik

fəaliyyətim Laçında, sonralar Goranboyda, Qaxda və Cəlilabadda davam elədi. 2006-cı ildə təqaüdə göndərildim.

**– Bir az uşaqlıq arzularınızdan danışardınız. O illər sənət seçimi ilə bağlı hansı arzularınız vardı? Bu arzular tez-tezmi dəyişirdi? Heç könlünüzdən raykom katibi olmaq keçirdimi? Təbii ki, o vaxt icra başçısı anlayışı yox idi.**

– Tam səmimi deyirəm, heç vaxt könlümdən raykom katibi olmaq arzusu keçməyib. Vəzifədə olanlardan kiminsə öz tərcümeyi-halını zənginləşdirmək üçün "əlavə səhifələr" yazması barədə də konkret fikir söyləyə bilmərəm. Sualınızın cavabına bir az uzaqdan başlamaq istərdim... Mənim ana nənəm Sadınlar kəndindəndir. Erməni-müsəlman davasında ermənilər Sadınlar kəndini yandırmışdılar və nəticədə 32 nəfər öldürülmüşdü. Nənəm danışardı ki, o zaman 13 yaşı vardı. Evdən çıxıb əvvəlcə Qarıqışlağa, oradan da Qılınclı kəndində Məşədi Molla Mehdigilə qaçmış, bir müddət orada qalmışdır. Yalnız ermənilər geri çəkilməyə məcbur edildikdən sonra öz kəndlərinə qayıtmışdı. O, həmişə bu müharibənin gətirdiyi bəlalardan söhbət açar, başqa mövzudan danışmazdı. Özü də həmin müharibəni "erməni-müsəlman davası" adlandırırdılar. Nə vaxt eşitmisən ki, "erməni-türk müharibəsi" desinlər? Bunun kökündə dini mübarizə dururdu. Təxminən o kökdə mənim uşaqlığım formalaşdı.

Həm də o vaxtlar orta məktəbdə davalı kinolar göstərirdilər. Bizim bir əsgərin neçə "nemes"i qırdığını görürdük. Pionerlərin qəhrəmanlıq epizodlarına maraqla baxırdıq. Fikrimdən keçirdi ki, bizim də bu ərazidə müharibə olsaydı, o pionerlərin, komsomolların igidliklərini təkrarlayardıq, heç kimi satmazdıq, döyüşərdik. Bəlkə də bu düşüncələrlə yaxşı idmançı olmuşam. İnstitutda idmanın sambo növü üzrə yaddaqalan uğurlara imza atmışam. Necə deyərlər, bizim nəslin "döyüş damarı" mənim bəxtimə düşmüşdü. Elə yaxşı keyfiyyətlər var ki, kiminsə bəxtinə düşüb.

Bayaq da dedim, atam müəllim maaşı alırdı, kənddə yaşadığımızdan mal-qoyun da saxlayır, orta səviyyədə dolanırdıq. Praktiki olaraq bütün laçınlılar kimi uşaqlığımız yaxşı keçib. Amma uşaqlıqda bir arzum reallaşmadı. Yadımdadır, kəndimizdə bir nəfər oğluna velosiped almışdı. Nə qədər götür-qoy elədik, artırıb mənə bir velosiped ala bilmədik. Həyata keçməyən o arzum heç yadımdan çıxmır. Sonralar aldığım maşınlar da "uşaqlıq nisgili"nin yerini "doldurmadı". Əlbəttə, indi yurd, torpaq nisgili ilə müqayisədə bu nisgil çox kiçik görünsə də, hər halda uşaqlıqdan danışarkən bunu deməliydim.

**– Ağrılı da olsa ötən əsrə – 80-ci illərin sonlarına, 90-cı illərin əvvəllərinə qayıdaq. İlk dəfə əlinizə silah götürüb erməni qəsbkarlarına qarşı vuruşduğunuz illəri necə xatırlayırsınız?**

– 1988-ci ildən, yəni məlum hadisələr başlayandan daim əlimdə silah olub. Dedim axı, mən hərbi zabit olmuşam, bu sahəni adi mülki adamlardan daha yaxşı bilirəm. Bu səbəbdən mənim ətrafımda cavan adamlar yığılırdılar. Hələ o zaman polisdə rotalar yaradılmamışdı. Lokal döyüşlər olurdu, onlar bizə tərəf, biz onlara tərəf güllə atırdıq. Təbii ki, heç nə görmürdük. Nə biləsən güllə getdi kiməsə dəydi, dəymədi. Yarı sülh vaxtıydı, nisbi sakitçilik idi...

İlk dəfə erməni "boyevik"ləri ilə qarşılaşdığım səhnəni yaxşı xatırlayıram. Polis şöbəsinin rəis müavini işləyirdim. 1989-cu il, avqustun 29-da "UAZ"la nahara gedirdim. Maşını Şahin sürürdü. RTS-də olurduq. Ratsiya ilə dedilər ki, Ağanus tərəfdə, səhv etmirəmsə, Pirin yalı deyilən ərazidəki meşədə silahlı erməni "boyovik"lərini görüblər. Şöbədə təkcə növbətçi qalmışdı. Bir də gördüm rəhmətlik Şahverdiyev İsrafil piyada gəlir. İsrafil də tarixən qoçaq adamdı. Onu çağırdım, oturdu maşına. Unannovundandı. Dedim oraları yaxşı tanıyırsan, gedək. Ratsiya ilə şöbəyə tapşırıq verdim ki, filan səmtə kömək göndərin. Beləliklə, mən, İsrafil və Şahin ermənilərin göründüyü əraziyə yola düşdük. Həmin yerə bir dik yol çıxırdı. Elə bil ürəyimə damdı ki, bu yolu çıxan kimi bizi atacaqlar. Yoxuşun kökündə Şahinə işarə elədim ki, maşını saxla. Təxminən 7-8 metr qalxmışdıq ki, düzəngah başladı. Mən sol tərəfdən, İsrafil isə sağ tərəfdən irəliləyirdik. Mənim əlimdə avtomat, onun əlində makar vardı. Qəfildən cığırda iki erməni "boyevik"i ilə qarşılaşdıq. Deyim ki, çətin məqamlarda heç vaxt özümü itirmirəm. Sonradan fikirləşərəm, dəhşəti hiss edərəm, ola bilər qorxaram, kövrələrəm, amma o anda tüküm də tərpənmir. Ani olaraq avtomatla bunların başının üstündən dalbadal atəş açdım. Aramızdakı məsafə çox yaxın idi. İstəsəydim asanlıqla öldürə bilərdim. İsrafil də çox cəld adam idi. Qarşısındakı erməninin boynundan tapança ilə atdı. Görünür, güllə fəqərəni qırmamışdı. Çünki sonradan onu Laçın şəhər xəstəxanasında sağaltdılar. Bu birini isə mən tutdum. Tez fırladıb üzüstə qoydum, əlini-qolunu bağladım. Şəkli də var bizdə.

Sonralar uzun bir döyüş yolu keçdik. Öldürdüklərimiz də oldu, əsir götürdüklərimiz də. Biz də ağır itkilər verdik, nə qədər cəsur oğullarımız şəhidlik zirvəsinə yüksəldilər. İndi də bədənlərində müharibənin yaralarını daşıyan yüzlərlə Qarabağ qazisi qələbə müjdəli döyüş üçün Ali Baş Komandanın əmrini gözləyir. Bütün laçınlılar o günün çox da uzaqda olmadığına inanırlar.

**– Silahı qələmlə əvəz etdiyiniz vaxtlar da olub. Bu hansı zərurətdən yarandı?**

– Bu, ilk növbədə daxili tələbatdan irəli gəlir. Bir söz deyim də. Sən qələm əhlisən. Bakıya gələndən sonra yazmamısan ha, gərək qanında ola. Elə məsələlər var ki, təkcə təhsillə bağlı deyil. Mən nə ədəbiyyat, nə də tarix üzrə ali təhsil almışam. Amma uşaqlıqdan şeir yazırdım. Raykomda işləyəndə də yazı-pozudan ayrılmamışam. Yəqin təsdiqləyərsiniz ki, utancaqlıq dağ adamlarının çoxuna xas olan bir xüsusiyyətdir. Nə qədər tanışımızın utancaqlığının ucbatından istedadını üzə çıxarmadığının dəfələrlə şahidi olmuşuq. Elə indi yaşımızın bu vaxtında da, vəzifədə də utanırıq. Əslində mən silahı qələmlə əvəz etməmişəm, bəlkə zərurətdən qələmi silahla əvəz etmişəm. Bir halda ki, "silahı qələmlə əvəz eləməyimin" səbəbini soruşursunuz, deyim. Arada bir sakitçilik oldu. Elə həmin sakitçilik indi də var, atəşkəsdi. Laçından çıxandan bir neçə il sonra ANS-ə baxırdım. 3 nəfər laçınlını Laçının işğalının ildönümü münasibətilə danışdırırdılar. Onlardan birini yaxşı tanıyırdım. Laçında da cinayətkar idi, burada da əməli-saleh adam deyildi. Dolam-dolaşıq işlərlə məşğul olurdu. Laçında döyüşlərdən elə danışırdı ki... Elə bil ayıldım. Axı bu hadisələrin içərisində idim. Hətta polis rəisi işləyəndə də mətbuat orqanlarında müntəzəm yazılarım çıxırdı. Bu verilişdən sonra fikirləşdim ki, onsuz da biz Laçına qayıdacağıq. Amma 10-15 il keçəndən sonra belə dana oğruları, ömründə erməniyə bir güllə atmayan adamlar, sülh vaxtı erməni ilə ağız-ağıza öpüşənlər, hər kənddə 20 kirvəsi olanlar özlərini, atalarını Sultan bəy kimi, Xosrov bəy kimi "qəhrəman edəcəklər". Qərara aldım ki, daim ön cəbhədə olan bir şəxs kimi imkanım, savadım, təcrübəm daxilində təəssüratlarımı mütləq yazım. Beləcə iki kitabım işıq üzü gördü. "Cığırlar birləşsələr..." və "Ora Vətəndir". Sərhəd xətlərinin arxasında Laçının şəkli fonunda hər iki kitabın rəmzi mənası belədir: "Cığırlar birləşsələr ora Vətəndir". İki kitab da çapa hazırdır. Sadəcə olaraq, Prezident məni icra başçısı təyin edəndən sonra kitabların çapına fasilə verdim, düşündüm ki, deyərlər vəzifəsindən istifadə edir. Təbii ki, yazıların davamı var. O vaxt yazıram ki, yazmaya bilmirəm.

**– İstefada olan polkovnik rayona icra başçısı təyin olunması haqqında sərəncamı necə qarşıladı? Ölkə başçısı sizə hansı tövsiyələrini verdi?**

– Mən hansı rayonda işləmişəmsə yaxşı polis rəisi olmuşam. Yaxşı polis rəisi olmaq üçün gərək humanist insan olasan. Ən əsası budur. İndi hüquq-mühafizə orqanlarında çalışan şəxslərin icra başçısı təyin edilməsinə az da olsa rast gəlinir. Heç kim icra başçısı doğulmur. İcra başçısı hazırlayan məktəb də yoxdur. İcra başçısı ilk növbədə xalqını sevməli, Vətənə,

dövlətə sədaqətli olmalı, dünyagörüşü, savadı, intellekt səviyyəsi kəskin surətdə seçilməlidir. Demirəm icra başçısı dahi olmalıdır. Amma millətinin, xalqının, dövlətinin tarixinə bələdçiliyi tarix müəllimindən, şeirə, sənətə bağlılığı ədəbiyyat müəllimindən, Vətəni sevmək hissi komandirdən az olmamalıdır. Bu, çox məsuliyyətli vəzifədir. Ölkənin birinci şəxsi sənə etibar edibsə, sərəncamına qol çəkibsə özünü doğrultmalısan. Hətta xarakterində hansısa nöqsan varsa, mütləq aradan qaldırmalısan. Nəyi bilmirsənsə oxumalısan, öyrənməlisən. Əlbəttə, bu keyfiyyətlər vəzifəsindən asılı olmayaraq hər kəsə aiddir. İnsan bütün yaş dövrlərində təhsilini artırmalıdır. Həzrəti Məhəmmədin "Qəbir evinəcən oxumaq" müdrik kəlamını Lenin "Oxumaq, oxumaq, yenə də oxumaq" şüarına çevirmişdi. Müxtəlif xalqlarda da bu barədə oxşar deyimlər mövcuddur. İnsana oxumaqla deyil, qarın toxluğuyla, cib doluluğuyla qiymət verilsəydi tarixin ayrı-ayrı dönəmlərində böyük şəxsiyyətlər dönə-dönə oxumağın vacibliyini önə çəkməzdilər. Ümumiyyətlə, hər bir insan, xüsusilə özünü kişi adlandıran kəs saatlarla oturdu, yedi, içdi, üzr istəyirəm, qarnını gəbərtdi, əlini çənəsinə qoyub əsnədi, yatdı, Allaha and olsun, ondan adam olmaz.

Prezidentin tövsiyələrinə gəldikdə səmimi deyim ki, ölkə başçısının qəbulunda olmağın özü böyük bir məsuliyyətdir və istər-istəməz adamı zəhm basır. Bir onu xatırlayıram ki, İsmayıllı hadisələrindən sonra idi. Ölkə başçısı dedi ki, bəzən vəzifəyə təyin etdiyimiz adamlar əhali ilə yaxşı dolanmırlar. Elə bil Allah ürəyimə bir "xof saldı", Laçın haqqında, laçınlılar haqqında deyə biləcəklərimi Prezidentə çatdırdım. Bildirdim ki, hələ bir laçınlı siyasi partiya yaradıb dövlətin işinə maneçilik törətməyib. İkincisi, elə bir laçınlı radikal jurnalist olmayıb ki, dövlət haqqında, xalq haqqında, ayrı-ayrı məmurlar haqqında ağzına gələni yaza. Bu fikirləri ona görə çəkinmədən söyləyirəm ki, ilk dəfə Prezidentə demişəm. Dəqiq yadımdadır ki, məni təmkinlə dinləyən Prezident "Atamın laçınlılara böyük hörməti olub, mənim də laçınlılara xüsusi hörmətim var" – dedi.

Evə qayıdanda, həyəcan ötüşəndən sonra Prezidentin dediklərini sözbəsöz xatırladım. Öz-özümə sual verdim ki, ulu öndərin laçınlılara niyə böyük hörməti olub və cənab İlham Əliyevin niyə xüsusi hörməti var? Mən bunun səbəbini tarixi köklərdə axtardım və bu qənaətə gəldim ki, Heydər Əliyev Naxçıvanda böyüyüb formalaşsa da, nəsil-nəcabəti sovet hakimiyyəti qurulana kimi Biçənək aşırımından bəri Sisyan, Qafan, Laçın və Qubadlını özündə birləşdirən Zəngəzur mahalındandır. Biz demək olar ki, eyni dağların, təbiətin yetirmələriyik. Təbii ki, Heydər Əliyevin laçınlılar haqqında müsbət fikirdə olmasının bizim bilmədiyimiz başqa səbəbləri də vardı.

Cənab İlham Əliyevin laçınlılara xüsusi hörmətinin səbəbini isə axtarmağa dəyməz. Prezidentin 2011-ci ildə 50 illik yubileyini ailəsi ilə birlikdə laçınlılarla keçirməsindən böyük səbəb varmı? Görünür, prezidentliyi dövründə laçınlıları daha yaxından tanıyıb, laçınlıların döyüşdə, Laçın polisinin Horadizin azad edilməsində xüsusilə fərqləndiyini yaxşı bilir. Laçınlılar bu hörməti qazanıblar.

**– Qəbulunuza gələn vətəndaşların narahatçılığı daha çox nədəndir?**

– Qəbula gələn 10 nəfərdən heç olmasa 3-ü, 5-i desə ki, Akif müəllim, siz də döyüşmüsünüz. Nə təhər edək ki, torpaqlarımıza qayıdaq, orduya, Prezidentə kömək edək, özümü xoşbəxt hesab edərəm. Hələ ki, məcburi köçkünlüyün yaratdığı problemlərlə əlaqədar gəlirlər. Taxtakörpüdə, – indi biz bu qəsəbəni "Laçın obaları" adlandırırıq, – qəbula hələn hər 10 nəfərdən 8-i iş istəyir. Məlumdur ki, əsas iş yerləri büdcə təşkilatlarındadır, həmin yerlər də artıq tutulub. Yeni işçi götürmək üçün gərək hansısa həkimi, müəllimi, tibb bacısını, mədəniyyət işçisini və kitabxanaçını işdən çıxarasan. Bundan xaricdə isə iş yoxdur. Qalırsan naəlac, insanlara iş verə bilmirsən. Mən yalandan söz də vermirəm, reallığı aydınlaşdırıram.

Son vaxtlar mənzil problemi ilə bağlı müraciət edənlərin sayı xeyli azalıb. Prezidentin Taxtakörpüyə gəlişindən sonra burada böyük abadlıq işləri görülüb, indi də bu işlər davam etdirilir. Yaxşı mənada "Laçın obaları" sanki bir şəhərə çevrilib. Laçınlı məcburi köçkünlər mərhələ-mərhələ yeni evlərə köçürülür. Yaxın vaxtlarda 1500 evin tikiləcəyi də nəzərdə tutulub. Bir zümrə laçınlı var ki, onları Laçından tanıyırdım. Çünki mən Laçından çıxanda 42 yaşım vardı, formalaşmış bir adam idim. Müxtəlif vəzifələrdə, o cümlədən polis rəisi vəzifəsində işləmişdim. Bu tip adamlar raykomun qapısından əl çəkmirdilər, həmişə hökumətdən nəsə qoparmağa çalışırdılar. Amma yaşayışı ilə yaxından tanış olanda görürdün ki, özü işləyir, arvadı işləyir, oğlu işləyir, gəlini işləyir. Haradasa bir uzaq qohumu kənarda qalıb, işsizdir. Başlayır şantaja, müxtəlif təşkilatlara yazmağa ki, kimsə qorxa, çəkinə. Beləri işləmək də istəmirlər, deyirlər bir maaş kartı verin, ayın axırında bankomatdan pul çıxardaq. Bu da camaatın psixologiyasını pozur, pis əhval-ruhiyyə yaradır. Belə hallara qarşı mübarizə aparırıq, praktiki olaraq yığışdırmışıq.

Laçınlı olan şəxs ehtiyacı olanda da kişi kimi gəlir , kişi kimi qəbul olunur, kişi kimi yola salınır. Məndə qəbul günləri yoxdur. Nə vaxt gəlirlər qəbul edirəm. Amma görürsən eyni adamlar hər qəbul günü gəlib oğluna iş istəyir. Söhbət əsnasında məlum olur ki, oğlu heç əsgərliyə də getməyib. Lakin beləri Laçın camaatının mində biri də deyil.

**– Əhalinin bütün təbəqələri ilə rəftarınızdan hamı razıdır. Keçmiş polis rəisinin insanlarla bu cür gözəl ünsiyyət qurması hətta çoxlarını təəccübləndirir. Nədənsə cəmiyyətdə belə bir fikir formalaşıb ki, vəzifəli şəxs mütləq səsinin tonunu qaldırmalı, əlini stola çırpmalıdır. Bu yanlış yanaşmaya münasibətinizi bölüşərdiniz.**

– Hər peşənin yaratdığı spesifik xüsusiyyətlər var ki, bəzi adamlarda vərdişə keçir. Buna peşə xəstəliyi də deyirlər. Elə belə də qəbul eləyək. Nöqsanlara da bu yönümdən yanaşaq. Sovet dönəmində ziyalı bir adam polisdə işləyəndən 2-3 il sonra xarakteri deformasiyaya uğrayırdı. Onda yuxarıdan nəyisə amiranə demək, qışqırmaq, hətta insanlara əl qaldırmaq kimi xoşagəlməz cəhətlər formalaşırdı. Bayaq dedim, mən ağır situasiyalarda özümü itirən adam deyiləm. Amma bir şeir söyləsən təsirlənib ağlayaram. Bir dəfə yüksək rütbəli rəhbər işçi də məndən sən soruşanı soruşdu. Dedi ki, 16 il polis rəisi işləmisən, ancaq icra başçısı vəzifəsinin statusu başqadır. Bildirdim ki, mən polisə gələndə yaşım 30-u keçmişdi, artıq şəxsiyyətim formalaşmışdı. Sonrakı polis illəri məni heç bir peşə xəstəliyinə sala bilmədi. Təbiətimdəki humanistlik, böyük-kiçik yeri bilmək, sadəlik, – soruşduğunuza görə deyirəm, – dəyişmədi.

İcra başçısı isə tamamilə fərqli vəzifədir, məsuliyyət yükü daha ağırdır. Prezidentin sərəncamı ilə vəzifəyə təyin olunub adamları söymək, təhqir etmək bağışlanılmaz qüsurdur və bəraəti yoxdur. Bu nəinki bəndəyə, Allaha da xoş getməz. İcra başçısının istənilən şəraitdə insanları dinləmək qabiliyyəti olmalıdır. O, heç vaxt hissə qapılıb təmkinini pozmamalıdır.

**– Belə bir deyim var: insan vəzifədə tanınar. Bu deyim haqqında siz nə deyərdiniz?**

– Yüzə-yüz düzdür. Birdən evdə uşaqlar da, bəzi dostlar da deyirlər ki, özünü çox sadə aparırsan. Hansısa icra başçısının “ciddi davranışı”nı nümunə də göstərirlər. Deyirəm ki, orduda zabit olanda da, raykomda çalışanda da, iş icraçısı, baş mühəndis, polis rəisi işləyəndə də təbiətimdən gələn bu xasiyyətimi dəyişməmişəm. Adam özünü dartmaz. Hamımızı Allah yaradıb. İslam dini ilə yaxından, uzaqdan tanış olan insan özündən razı olmaz. Laçında hamı bilir ki, Akif Səlimovu Prezident icra başçısı təyin edib. Bu gün laçınlılar mənim xasiyyətimdə, davranışımda, danışığımda, ləyaqətimdə, ləhcəmdə, oturuşumda-duruşumda bir dəyişiklik görsələr, bunu ömür boyu bağışlamazlar. Sadəlik çox vaxt adama başucalığı gətirir. Sadə olmaq lazımdır də. Mənim başqalarından nəyim artıqdır ki? Laçınlıların bir-birindən bir millimetr artıqlığı-əskikliyi yoxdur. Hələlik Prezident mənə etimad göstərib. Həm də bu vəzifə bizim iradəmiz xaricindədir. Ölkə başçısının özünün, ailəsinin davranışına, 2011-ci ildə Taxtakörpüdə laçınlılarla görüşündəki jestinə baxın. Azərbaycanın birinci şəxsinin özünü bu qədər sadə aparmasının qar-

şılığında onun yerlərdəki səlahiyyətli nümayəndələrinin başqa cür davranmağa haqqı varmı?

**– Sizcə, məsul vəzifədə çalışan şəxs necə işləməlidir ki, vəzifədən gedəndən sonra ona hörmət bəsləyənlərin, salam verənlərin sayı nəinki azalmasın, hətta artsın?**

– Bu iş mənim başıma çox gəlib. Goranboyda rəis işləyəndə cənab nazir məni sərəncama götürdü. Zənglərin sayı xeyli azaldı, amma qurtarmadı. Baxdım ki, münasibət saxlayan adamlar var. Müəyyən müddətdən sonra Qaxa rəis göndərildim. Cəlilabaddan təqaüdə gedəndə isə 6 il qeyri-dövlət sahələrində çalışdım. İnsanlara yenidən qiymət vermək imkanım oldu. Təbii ki, insanın insana hörmət qoyması qarşı tərəfdəki adamın şəxsiyyətindən də asılıdır. O adam sənə təmənnalı münasibət bəsləyibsə, bu gün sənə salam vermirsə günah təkcə vəzifədəkinin deyil. Amma gərək vəzifədə işləyən adam sabahını düşünsün, anlasın ki, nə vaxtsa bu vəzifədən gedəcək. Heç kəs peyğəmbər deyil. Vəzifədə işləyən şəxs ilk növbədə dövlətin mənafeyini öndə tutmalıdır. Vəzifənin yaxşı mənada yaratdığı girəvələr var ki, bundan rayon üçün, əhali üçün istifadə edilməlidir. Məsələn, mən polis rəisi olanda istəsəydim də təhsil nazirinə zəng edə bilməzdim. Amma indi təhsil nazirliyinin 4 nömrəsini yığıram, mənə cavab verirlər. Rayonla bağlı hansısa problemin həlli üçün nazirliklərlə əlaqə saxlayıram.

Rayonun rəhbəri və ətrafında olanlar əxlaqları ilə seçilməli, bişərəf işlərlə məşğul olmamalıdır. Laçında 1 aylıq körpədən tutmuş 90 yaşında nənəyə qədər təxminən 36 min qadın var. Laçınlı kişisi üçün bunların hər biri anadır, qızdır, gəlindir, nəvədir. Bizə qədər işləyənlər olub, bizdən sonra da işləyənlər olacaq. Laçınlılar qadınlara münasibətdə səhvi olanları heç vaxt bağışlamırlar.

**– Yəqin ki, üzünüzə tərifləyənlərlə yanaşı arxanızca danışanlar, danos yazanlar da olur. Təmkininizin sərhədi nə vaxt bitir və cavab verməyi vacib bilirsiniz?**

– Birinci şəxs hövsələli olmalıdır. Təbiətən hövsələli deyilsənsə də, bunu özündə aşılamalısan. Yaltaqlanan adamlardan xoşum gəlmir. Hüquq-mühafizə orqanlarında, məxfi əməkdaşlarla işləsəm də, ondan-bundan danos deyənləri, söz gəzdirənləri qətiyyən sevmirəm. Amma gözümü bağlayası, qulağımı tutası da deyiləm. 2005-ci il parlament seçkilərində şəkillərimi cıranlar haqqında məlumatları soyuqqanlı qarşılayıram. Bəzən deyirlər ki, seçkilərdə filankəsi müdafiə edənlər indi sənin yanında işləyirlər. Belə söhbətlərə əhəmiyyət vermirəm, məndə düşməndən başqa kimsəyə qarşı qisas hissi yoxdur. Dünən belə deyib, özü bilər, Allahı bilər. Bu gün işimizə yarayır, işləyir də.

Təvazökarlıqdan kənara çıxmasın, ermənilərlə ilk münaqışələr başlayandan proseslərin önündə olmuşam. Təbii ki, o vaxt mərkəzi hakimiyyət vardı. Azərbaycan da digər müttəfiq respublikalar kimi Sovetlər İttifaqının tərkibində idi. Laçınla Gorusun sərhədində hər iki rayonun məsul şəxsləri, o cümlədən hüquq-mühafizə orqanlarının işçiləri görüşürdülər. Bu görüşlərə əvvəlcə polis rəisinin müavini, sonra polis rəisi kimi mən də qatılırdım. Hələ münaqişələr dərinləşmədiyindən bir-birimizə güllə atmamaq, günahsız adamları öldürməmək barədə danışıqlar aparırdıq. O zaman həm kriminal hərəkətlərə meyilli, həm də müxtəlif səbəblərdən vəzifələrini itirmiş bir qrup insan yaranmış vəziyyətdən şəxsi mənafeləri üçün yararlanmağa çalışırdılar. Məqsədlərinə çatmayanda sabitliyi qoruyan, əlində silah "erməni saqqallıları"na qarşı vuruşan vətənpərvər oğullara ləkə yaxır, öz aləmlərində böhtanlarının inandırıcı görünməsinə "səbəb" də tapırdılar. Hətta sərhəddəki görüşləri Laçının və Gorusun polis rəislərinin "bacanaq" olması ilə əlaqələndirirdilər. Belə görüşlərin birində Gorusun polis rəisindən soruşdum ki, Mişa, sənin arvadın milliyətcə kimdir, haralıdır? Bildirdi ki, arvadım ermənidir, Gorınzır kəndindəndir. Dedim axı qəzetlər bizim bacanaq olduğumuzu yazırlar. O, cavab verdi ki, Gorusda da bəzi adamlar məni "Musurman Mişa" – deyə çağırırlar.

Goranboyda, Qaxda, Cəlilabadda polis rəisi işləyəndə də eyni şayiəni dövriyyəyə buraxırdılar. Bəzən şər-böhtan ustaları dəfələrlə təkrarlayandan sonra öz yalanlarına inanır, başqalarını da inandırmağa cəhd göstərirlər. Belələrinə hesabat vermək fikrindən uzağam. Ancaq onların "yazdıqlarımızı təkzib etmədi" arqumentini əllərindən alaraq həqiqəti söyləməkdə də bir qəbahət görmürəm. Tərəddüd edənlərə, şübhəsi olanlara bir daha bildirirəm ki, mənim həyat yoldaşım ukraynalıdır. Özündən kiçik bir bacısı var, Krımda yaşayır. Əri də , yeddi arxa dönəni də ukraynalıdır. Mənim isə iki oğlum var. Hər ikisi polis zabitidir.

Azərbaycanda vətənpərvər oğullara qarşı zaman-zaman erməni kartından istifadə ediblər, indi də edirlər. Təəccüblüsü odur ki, nə özü, nə qohum-əqrəbası, nə də yaxınları erməniyə bir güllə atmayanlar şərəfli döyüş yolu keçən insanları ermənilərlə qohumluqda günahlandırırlar. Elə öz timsalımda keçdiyim yola nəzər salanda bu qənaətə gəlirəm ki, mənə etimad göstəriləndə, fəaliyyətimdəki uğurlar az-çox nəzərə çarpanda bədxahlarım daha da fəallaşırlar. Laçınlı gənclərin hərbi sahəyə cəlb edilməsi, peşəkar zabitlərin hazırlanması istiqamətində təşəbbüslər irəli sürmüşük. "Hər laçınlı ailəsi dövlətə bir zabit versin!" devizinə qoşulanların sayı artmaqdadır. Hərbi-vətənpərvərlik məsələlərini rayon rəhbərliyi həmişə diqqətdə saxlayır. Dövlət qurumlarından da bizə yüksək səviyyədə dəstək gəlir. Xüsusilə Baş nazirin müavini, Qaçqınların və Məcburi Köçkünlərin İşi üzrə Dövlət Komitəsinin sədri Əli

Həsənovun köməyini daim hiss edirik. Qarabağ müharibəsinin iştirakçılarına, şəhid ailələrinə, Vətən yolunda sağlamlığını itirənlərə xüsusi qayğı göstəririk. Camaatın arasında böyük ruh yüksəkliyi var. Möhtərəm Prezidentimizin tövsiyələrini əsas tutaraq imkanımız daxilində Laçın camaatının problemləri ilə məşğuluq və dedi-qodulara vaxt ayırmağa ehtiyac duymuruq.

Təəssüf ki, sensasiya xatirinə yazı yazanlar çirkin əməllərindən əl çəkmirlər. Əksinə, bir az da həyasızlaşıblar. Ucuz adamlardır, bəd niyyətlərini də gizlətmirlər. Kimlərinsə vasitəsi ilə zəng etdirirlər ki, "hörmət edin" yazını saytdan çıxardaq. Yazmağın da təhəri var axı. Bir var yazasan ki, eşitdiyimizə görə, "filankəsin bacanağı zəncidir". Bir də var şərini-böhtanını heç bir sübutsuz, az qala həqiqət olduğuna yüz faiz əmin olduğun kimi arxayın yazasan. Saytların birində yazıblar ki, Akif Səlimovun oğlunun biri ağır cinayət edərək Ermənistandakı xalasının yanına qaçıb. Bunu yazan jurnalisti bağışlamaq olarmı, bu insan islam əhlidirmi? Onlarla hüquq müstəvisində qarşılaşacağıq. Hər kəs etdiyi əməllərə görə qanun qarşısında cavab verməlidir. Onda kimin cinayətkar olub-olmaması, erməniyə nə dərəcədə yaxınlığı aydınlaşar.

Belə "qələm sahibləri"nin erməni kəşfiyyatına işləməsi də istisna deyil. Çünki Leyla Yunus faktorunun ölkə gündəmini zəbt etdiyi məqamda "köhnə bayatılar"ın təzədən "oxunması" təsadüf sayıla bilməz. Düşünürəm ki, bütün bunlar ictimaiyyətin diqqətini əsas hədəfdən yayındırmaq cəhdidir. Özü də çox uğursuz cəhddir.

Təkcə Laçında deyil, başqa rayonlarda da, elə paytaxtın özündə də ermənilərə qarşı vuruşan, mübarizə aparan insanları gözdən salmaqda maraqlı olan gizli qüvvələr mövcuddur. Həmin qüvvələr qanunun aliliyi çərçivəsində durdurulmalıdır və durdurulacaqdır.

**– Yeri gəlmişkən, siz laçınlı gənclərin hərbi sahəyə cəlb edilməsi, peşəkar zabitlərin yetişməsi üçün ciddi addımlar atırsınız. Bu istiqamətdə görülən işlərin nəticəsi varmı və sizi qane edirmi?**

– Mən sovet dövründə zabit kimi hərbi xidmət keçmişəm. Qarabağ döyüşlərində isə 400 nəfərin komandiri olmuşam. 43 polis işçisi şəhid olub, 3 polis işçisi Milli Qəhrəman adına layiq görülüb, 7 polis işçisi orden və medallarla təltif edilib. Döyüşçülərimizin fədakarlığına baxmayaraq biz torpaqlarımızın bir hissəsini itirdik. Danılmaz faktdır ki, psixoloji cəhətdən müharibəyə hazır olmamağımız, xristian dövlətlərinin erməniləri müdafiə etməsi və erməni məsələsinin dünyaya təhrif olunmuş formada çatdırılması müvəqqəti məğlubiyyətimizin əsas səbəbləridir. Amma peşəkar zabit kadrlarının azlığını da bu səbəblər sırasına aid edə bilərik. Artilleriya qurğusundan istifadə etməyi bacaran zabitlərin sayı barmaqla sayılacaq qədər az idi. Yəni xalqımızın ciddi zabit aclığı vardı.

Əlbəttə, hal-hazırda ordu quruculuğu o dövrlə müqayisəyə gəlməyəcək dərəcədə sürətlənib. Biz də vəzifənin yaratdığı fürsətdən istifadə edərək rayon daxilində bu sahəyə diqqəti artırdıq. Gənclərimizi hərb sənətinə yönləndirmək üçün təbliğat işini gücləndirdik. Praktiki olaraq bütün məktəblərdə olduq, şagirdlərlə görüşdük. Təşəbbüsümüz nəticəsiz qalmadı. Əvvəlcə 4 nəfər hərbi akademiyaya, 7 nəfər isə hərbi liseyə qəbul olundu. Akademiyaya qəbul olanlara 200, liseyə qəbul olanlara 100 manat ayırdıq ki, onların oxuması ailəyə maddi zərər vurmasın. Sonra hökumətə müraciət etdik. Respublikada bu sahədəki mövcud şərait araşdırıldı. Bu işdə Qaçqınların və Məcburi Köçkünlərin İşləri üzrə Dövlət Komitəsinin sədri Əli Həsənovun hərtərəfli köməyini xüsusi qeyd edərdim.

Dünənki tədbirdə (2 may 2014-cü il) müdafiə nazirinin müavini, hərbi akademiyanın rəisi, liseyin rəisi, təhsil naziri, Tələbə Qəbulu üzrə Dövlət Komissiyasının sədri, hərbi çağırış idarəsinin rəisi, 10 icra başçısı, 10 deputat iştirak edirdi. Orduya güclü axının olması, bu axının içərisində laçınlı gənclərin önə çıxması bizi sevindirir. Unutmayaq ki, zabit müharibənin taleyini həll edən şəxsdir. Prezidentimiz ali səviyyədə bütün tədbirləri görüb. Ən müasir hərbi texnika ilə təchiz olunmuş Milli Ordumuza bu texnikanı yaxşı idarə edə bilən təmizqanlı, Vətəninə bağlı azərbaycanlılar lazımdır. Bütün bunları nəzərə alıb "hər nəsildən bir zabit olsun" ideyasını gerçəkləşdirmək niyyətindəyik. Hökumətimiz də sağ olsun. Təkliflərimiz Prezident səviyyəsinədək məruzə olunub və ilkin nəticələr var. Əminəm ki, bu il hərbi məktəblərə qəbul olunan laçınlıların sayı bir neçə dəfə artacaq.

**– Laçınla bağlı sualımızı qəsdən axıra saxladıq. Ərazisi işğal altında olan, əhalisi respublikamızın 60-a yaxın regionuna səpələnən rayona rəhbərlik etmək o qədər də asan deyil. Amma Laçınsız yaşamaq ondan da çətindir. Siz necə düşünürsünüz?**

– "Media forum"da bu barədə təəssüratlarımı bölüşmüşəm, yəqin oxumusunuz. Bir neçə il əvvəl də "525-ci qəzet"də bir yazım çıxmışdı. "Yuxuma girməyən Laçın" adlanan həmin publisistik yazıda vaxtı ilə nənəmdən eşitdiyim bir əhvalatı xatırlatmışdım. Erməni-müsəlman davasında Sadınlar kəndinə qaçıb bir müddət Məşədi Molla Mehdigildə yaşayan nənəm danışırdı ki, hər səhər yuxudan duranda Məşədi Molla Mehdi məndən soruşurdu ki, Hürizad, qızım, yuxuda nə gördün? Mən də gah anamı, gah da ermənilər öldürən bacımı gördüyümü deyirdim. O isə dərhal "çox şükür", "Allah, sənə şükürlər olsun" deyər, qoşa əllərini səmaya tuşlardı. On üç yaşlı uşaq bu hərəkəti yəqin ki, dərk etmir, bəzən də mollanın nəyə şükür etdiyinə təəccüblənirdi.

Böyüdükcə hadisələrin səbəblərini, ermənin bizə düşmən olduğunu, nədən bu davaların qarşısının alınmadığını dərk etsəm də, təkcə Məşədi Molla Mehdinin Allaha şükür etməsinin səbəbi mənə çatmırdı. İnstitutda

oxuyanda yay tətilində kəndimizə gəlmişdim. Bir dəfə məni narahat edən bu məsələni nənəmə dedim. O, təəccübləndi, amma mənim marağıma diqqət də yetirdi. Günlərin birində nənəmlə Qılınclı kəndinə getdik.

Məşədi Molla Mehdi nənə və nəvənin gəlişindən azca təəccüblənmiş kimi görünürdü. Çay-çörəkdən sonra nənəm və mən bir-birimizin sözünü kəsə-kəsə, fikirləri tamamlaya-tamamlaya gəlişimizin məqsədini açıqladıq.

Məşədi Molla Mehdi bildirdi ki, Allaha şükür etməsinin səbəbi Xorasanda dini təhsil alarkən müəllimindən eşitdiyi bir inancla bağlıdır. Müəllimim deyirdi ki, hələ islamdan öncə zərdüştlük vaxtından belə bir əlamət var ki, qəriblikdə olan kimsə yuxularında vətəni görmürsə, o, mütləq doğulduğu yerə, yurda qayıdacaq. Bu fikir həmişəlik beynimə həkk olundu. Qaçhaqaç vaxtı ona görə şükür edirmişəm ki, Hürizad yuxularında kəndini görmürdü. Mən də şükür edirdim ki, bu yetim kəndlərinə, elinə, obasına dönə biləcək.

Həyatın axarında bu söhbətin təfərrüatlarını unutduğumu zənn edirdim. Laçınsızlıq mənə həyatımı yenidən yaşatdı. Ömrümün hər anını, kiçicik həyat hadisələrini, adi deyimləri və münasibətləri də təkrar-təkrar yaşadım. Xatırladım, həqiqətdə olduğu kimi canlandırmağa çalışdım, qırx iki illik vətən ömrümü eninə, boyuna gəzişdim, yanıb-yaxıldım. Elə bir anım olmur ki, vətən bir neçə saniyə də olsa yadımdan çıxsın. Yuxular da görürəm. Nə Laçın girir yuxuma, nə də kəndimiz Qarıqışlaq... Var ol baba Zərdüşt, yerin behişt olsun, xorasanlı ruhani, qəbrin nurla dolsun, Məşədi Molla Mehdi. Yuxunuza Laçın girməsin, laçınlı döyüşçülər! – deyirəm. El deyiminə görə Laçının yuxuma girməməsinə sevinirəm və yerimizə-yurdumuza qayıdacağımıza inanıram.

Nə qədər yaxşı yaşasaq, xalqımız bütün parametrlər üzrə bizi başa düşsə də, yurdsuz yaşamaq çox çətindir. Yüz adamın yüzü də eyni cür düşünmür. Bunun ümumxalq dərdi olduğunu başa düşənlərlə yanaşı, indinin özündə də, – torpaqlarınızı qoyub gəldiniz, – deyənlər tapılır. Laçınsız yaşayan adamların ən böyük dərdi vətənsizlikdir, ikincisi də Laçından kənarda qarşılaşdığı nadanlıqdır.

O torpaqların getməsində bütövlükdə hər birimiz günahkarıq. Hər kəsin öz günah payını laçınlının üstünə atması ədalətsizlikdir. Hətta yüksək post tutan məmurlar var ki, qaçqının, köçkünün könlünü yaralayır. Vəzifədə işləyən adam savadlı, vətənpərvər, xalqsevər olsa belə problemlər yaranmaz.

Heç vaxt yaddan çıxmayan Laçına qayıdacağımıza tərəddüdsüz inanıram. Mən bu prosesin içindəyəm. İcra başçısı olaraq laçınlılarla, xüsusilə rayonun yaşlı sakinləri ilə görüşəndə deyirəm ki, kişisən, burada ölmə. Bu sözləri qəlblərinə dəymədən, şad-şalayan deyirəm və onların gözlərindəki ümid qığılcımlarını aydınca görürəm.

**– Laçında doğulan insanlar dünyasını dəyişdikcə sanki Laçınımızı yenidən itiririk. Xalqın böyük sevgisini qazanan tanınmış müğənni, “Laçınım, Laçınım, Laçınım mənim” deyib daim haray çəkən Məhəbbət Kazımovun ölüm xəbərini eşidəndə hansı hissləri keçirdiniz?**

– Allahın işinə əl uzatmaq olmaz. Təbii ki, mən istənilən ölümü çox sakit qarşılayıram. Çünki bunu Allahın əmri hesab edirəm. Amma yanğılar sonradan üzə çıxır. Mən Məhəbbətlə bir neçə dəfə toyda görüşüb söhbət etmişdim. Qabaq-qabağa oturub çörək də kəsməmişdik. Məhəbbətin itkisi təkcə Laçının itkisi deyil. Məhəbbəti Laçın miqyasına salmaq ən azı qəbahətdir. Təbii ki, bizə bir köynək yaxındır deyə onu daha çox sevirik, daha yaxşı tanıyırıq.

Hökumətimiz də Məhəbbətin qiymətini bilirdi və ona əməkdar artist fəxri adı vermişdi. Mən icra başçısı təyin olunandan sonra xahiş etdim ki, bütün qeyri-rəsmi tədbirlər “Laçınım” mahnısı ilə başlansın. Planımız vardı ki, Fərhad Bədəlbəylini, Siyavuş Kərimini dəvət edib məsləhətləşək, “Laçınım” mahnısını simfoniya şəklinə salaq. Bu, Məhəbbətin də arzusu idi, çox təəssüf ki, sağlığında reallaşdıra bilmədik. Məhəbbət Azərbaycandan getdi. Məhəbbət həm də bir vətənpərvər kimi getdi. Məhəbbəti heç bir siyasət, heç bir quruluş, heç bir şərait dəyişə bilmədi. Nətər təbii idisə, elə də qaldı. Əsl laçınlı keyfiyyətini ömrünün axırınacan qorudu. Məhəbbət Laçından ötrü ölürdü. Laçından ötrü həyatını verməyə hazır idi. Bizdən ötrü bundan böyük təsəlli yoxdur. Elə laçınlı kimi də dünyasını dəyişdi.

**– Müsahibəmizin sonunda Laçında görüşmək arzusu ilə laçınlılara nə deyərdiniz?**

– Bu yaxınlarda Qaxda camaatla görüşdük. Rayonun rəhbər işçiləri də iştirak edirdilər. Dedim ki, bəzisi deyir ki, mənim arzumdur Laçına gedək. Bir başqası deyir ki, mənim ümidim var ki, Laçına qayıdaq. Məndə isə Laçına qayıdacağımıza inam yüzə-yüzdür. Bu inamın həm subyektiv, həm də obyektiv səbəbləri var. Subyektiv səbəb odur ki, biz emosional, yəni nəsil-nəcabət, ulular, ruhlar baxımından Laçına bağlıyıq. Dövlət adamı kimi obyektiv səbəbləri də bildiyimdən düşünürəm ki, Laçınlı kişisinin ikinci sözü olmamalıdır, Laçına mütləq qayıdacağıq. Ta bunun nöqtəsi, vergülü, tiresi yoxdur.

**Arif MƏMMƏDLİ**

**POEZİYA**



**Elman ELSEVƏR**

## EL BİLİR Kİ…

Yasaqdı düşündüyünü demək,
yasaq deyildi dediyini düşünmək.
Haqqın yoxdu dolub-boşalmağa,
cəhd edirdin boşanmağa.
Bu gün
sabah idi dünəndən baxanda.
Ümid köhlənini qovub, sən onda
can atırdın həyatını daşıyan, –
içində sevincin-kədərin,
sevgin, nifrətin, arzuların yaşayan...
ağ gəminin kapitanı olmağa.
Can atırdın bir də
İndi bir çoxundan bezdiklərinə.
Adladın maneələrdən qan axıdaraq.
Adladın,
ehtiyac duya-duya dost köməyinə,
qardaş dəstəyinə.
Müsibətlər çəkdi başın
qovuşunca istəyinə.
Fil də tab etməzdi dözdüklərinə.
Qarşıda qarlı dağ var hələ,-
aşmalısan.
Dünəndən qalma qorxunla
vidalaşmalısan...
Əlağasız,
Vahid olanadək savaşmalısan...
Bu gün, dünən olacaq yarın.
Gül açsın, məmləkətim,
Çiçək açsın arzuların!

## VAXTIMA ÖMÜR HÖRÜRƏM

**1.**

Vaxta ömür hördürürəm,
Həvəssiz hörür hörməni.
An-an vaxtı öldürürəm,
Zərrə-zərrə vaxt da məni.

İşığımı uçururam
Qaranlığı xışlamağa.
Qaranlıqsa uçub gəlir
Ürəyimdə qışlamağa.

**2.**

Vaxtla birgə işləyirik,
Vaxtım mənə çox iş görür.
Sökdüyünü söküb-atıb,
Hördüyünü bir də hörür.

Meydanlarım başla dolur,
Çox deyilən başa dolmur.
Bəbəklərim yaşla dolur,
Babəklərim yaşa dolmur.

Körpə-körpə ümidlərim
Bilmir qorxaq, qoçaq nədi.
Möhnətimin igidləri –
Qoç Koroğlu, Qaçaq Nəbi...

**3.**
Min illərdi yaşayıram,
Səkkiz yaşım tamam oldu.
İç özümü daşıyıram,
Bu yol Mənə gedən yoldu.

Sevincimdən oxuyuram
Bir-bir vurduqca ilməni.
Otay-butay toxuyuram
Gün-gün, ay-ay, il-il Məni.

Vaxtıma ömür hörürəm,
Həvəslə hörrəm hörməni.
Mən, vaxtımı yaşadıram,
Yaşadacaq vaxtım Məni.

## HƏR YERDƏN GÖRÜNƏN ÇİNAR

**1.**
Mən hansı bir Çinara
bənzədim ki, özümü –
soyuqlarda təzə-tər
yarpaqladı sözünü.

Hansı öndər Durnaya
Bənzədim ki, özümü –
Küləkdə pozulmadı
qatarının düzümü.

Mən hansı bir Rəssama
bənzədim ki, özümü –
Rənglərilə rənglədi
Rəngsizliyin üzünü:

Çoxun içində
təkdi.
Çoxun içində çəkdi...

Mən hansı bir insana
Bənzədim ki, özümü-
məhəbbəti –
Məhəbbət,
qranitdi dözümü.

Mən hansı bir şairə
bənzədim ki, özümü –
getdi ki, tək qoymasın
qürbətlərdə Nazimi...

***Aprel, 1981***

**2.**
*“Anadan kim doyub, kim, Bakım?”*
Aradım onu
meydanlarında Bakının.
Fəxri Xiyabanda tapdım –
baxdım
boyalara, rənglərə xiyabanda, baxdım,
gördüm uzaqdan
“alt dodaqdan
üst dodağa qalxa bilməyən”
ötkəm SƏSİ...
kirpiyimdə iki bulud giləsi
aydınca gördüm,
Dəfnə Budağı
çiçəkləmiş
Qranitin önündə:
Həyatın verdiyi rəngi
verir ölüm də!

***İyul, 2002***

## AĞRI POEMAMIZ

Tərs oxunmuş heroqlif tək
Tərsinə oxusan ***NUH***u,
Görəcəksən: –

Bəyaz, girdə üzünü,
qırğı; badam gözünü...
Mozdok-Berlin arasının
Bədənində izini.

Palıdın közü kimiydi,
Sözü də özü kimiydi...
Qaranlığı dağıdan
Günəşin üzü kimiydi.

Sevgisi ağ göyərçindi,
Sevinci atlı qarışqa,
Acısı-dağ.
Amma böyükdü yaşamaq eşqi
Tanrı dağdan dağ-dağ.
Sıxmırdı ayağını başmaqları babanın.

Uzundu səbri
Baş-quyruğu görünməyən Çin
səddindən –
Dünyanın ilk daş sərhəddindən.
Həvəsi at üstü idi,
Qəzəbi atüstü idi.
Yazın qırx birində
Ocaq çatdı əzəl oğlu, sonra yağı
Üstündə qarışqa yuvasının.
Yumuldu min-min il öncə
Günəşə açılan badam çiçəyinin
Ləçəkləri babanın.

Oturmuşam
Tanrı Qara xanın
Qaz olub, üstündə uçduğu
suların sahilində –
bozqırın başındayam – Qaf qazda.
Qisasa çağırır ürəyim.
Fikrim qardaşlığa yol arayır.
Kirpiklərim qırovdu.
Hayana baxıram İşıqlıdı – Əlyetməzdi;
Altaydı, Qaz bəydi – Əriməzdi;
Çalbayırdı, Dəlidağdı, Murovdu –
zirvəsində qar...
Nə göydə göyərçin görünür,
Nə yerdə qarışqalar.
Amma təsəllim –
Moskvada təhsil alır Muradım,
Nyu-Yorkda –
yeniyetmə umudum – var;
mənim Mən olmağa
ümidim var...

***Mart, 2001***

## YURD HAVASI

Yazbaşı
Göyərər təpələrin daz başı.
Dartınıb içindən işıqdan yapışar,
sallaşar, yellənər quzu-quzu otlar.
Yer-yurd qarış-qarış otlanar.
Mal qırpar, quzu otlar –
Yer-yurd örüş-örüş otlanar.
Şehdən, yağışdan içib
Yal-yamac otlandıqca otlanar.
Sürü qırpar, naxır otlar –
Otlaqlar otlandıqca
otlanar.

Bir çoban da ətəkləri
Örüş-örüş varaqlar.
Atlıya boy verməz
Otunu atyarmaz kövşənlər-qoruqlar
Yaşıllaşar düz dünya gözündə
qoruqçunun.
Örən örüşlər yağmur soraqlar...
Şehdən, yağışdan içib
yal-yamac otlandıqca otlanar...
Kimsə bir "Çobanbayatı" çalar,
bir "Çobanbayatı" çalar tütəkdə,
adamın ürəyi odlandıqca odlanar.

## SİZNƏN OYNAMAQ İSTƏMİRƏM

Oddu söz,
Söznən oynamaq istəmirəm.
Siz söz oynadır, söz güləşdirirsiz,
Siznən oynamaq istəmirəm.
Söz-söz dağa qaldırır,
söz-söz dağdan endirirsiz.
Söz kəsir, söz gəzir,
söz gəzdirirsiz.
Özünüzdən söz çıxarır,
sözün içindən çıxırsız.

Sözdən söz çəkir,
sözdən söz çıxarırsız.
Sözün altına girir,
qalmırsız söz altda –
sözün üstə çıxırsız,
ara sözüynən ev yıxırsız.
Sözünüzdən qaçır, bazar açır,
Ürəyinizdən tikan çıxarırsız söznən.
Oynamaq istəmirəm siznən.
Söz atır, havada tutursuz sözü,
Araya söz atır, söznən ara qatırsız,
Söz verirsiz,
Durmursuz üstündə sözünüzün,
Sözünüzdən dönür –
dönürsüz özünüzdən,
Xəncər yarası sağalır,
sağalmır yarası sözünüzün.
Sözü üzə vurursuz,
söznən baş saxlayırsız,
Sözü yerə vurur, ara vurursuz söznən,
Siznən oynamaq istəmirəm.

***

Yalayır sahilini...
İnanmır dəniz
Balıqqulağının dadsızlığına.
Qısılıb içinə
Kəşfini gözləyən neçə varlıq,
Dözür min bir səbrlə...
Dözür adsızlığına.
Sevgi nəğmələri oxuyur gül-kəpənəyə,
Bülbül-gülə, pişik-bülbülə...
Qara torpaq-hamısına.
Öldürür ölümü həyat, həyatı – ölüm.
Beləcə, gülüm,
Nə o çıxır sonuna bunun, nə bu onun.
Fırlanır Yer kürəmiz,
Biz, bir də dəniz...

**BU GÜNƏM,**
**DÜNƏN DEYİLƏM**

Sevinc üzük, qəm qaşıdır,
qaş üzüyə daş daşıdır.
Daş da, qaş da göz yaşıdır,
buza dönən barmaq nədir?

Daş oldum, noğul olmadım,
anama oğul olmadım.
Öldürdünüz, doğulmadım,
gördüyünüz mən deyiləm.

Üzük bəyaz qar daşıdır,
qaş alovun qardaşıdır.
Sevinc qəmə qar daşıdır,
bu qovhaqov, yormaq nədir?

Göy dərdiniz, yetişmədim.
sındırdınız, bitişmədim.
Ha yüyürdüm, yetişmədim –
bu mənəm, həmin deyiləm.

Qaş çarpanaq baş daşıdır.
üzük qaşın daşbaşıdır.
Qaş üzüyün baş daşıdır,
kəfən yırtıb durmaq nədir?

bu mənəmmi, soğuluram,
soğuluram, boğuluram…
Allah, Allah, doğuluram,
öləsiz ölən deyiləm...

**PUBLİSİSTİKA**

## “BABAMIN GÜNDƏLİYİ”
## III HİSSƏ

### “YÜKÜM QURĞUŞUN YÜKÜ”
### Yordu bu taylar məni...



Gündəlikdə elə yerlər var ki, onların üstündən keçə bilmirəm. Mütləq həmin hissəni də oxuculara çatdırmaq istəyirəm...

“...Qadasın aldığım Ruxun boynumda haqqı çoxdu, lap çox. BUNU HƏMİŞƏ YADDA SAXLAMALIYAM! BUNU UNUTMAĞA HAQQIM YOXDU! UNUTMAQ OLARMI? (seçim babamındır – S.C.) Bu gün yenə işdən yorğun-arğın gəldim, bazarlıq eləmişdim, Ruxum tez hər şeyi yerbəyer elədi, süfrə açdı, hamını yığdı başına, birgə şam elədik. Səni də yedizdirdi, sonra süfrəni yığdı. Mənə: “Nə qədər gecə düşməyib bir az dincəl, yuxusuz gecə gözləyir səni” dedi. Elə bil yarama duz basdılar. Sən buna bax, özü ora-bura qaçmaqdan ayaq üstə dura bilmir, mənim dərdimi çəkir. Deyəsən, onun bu sözü səni də tutmuşdu. Qeyri-ixtiyari sənə baxdım, baxışların tavana dikilmişdi, gözünün ucunda bir damla yaş donub qalmışdı. Bunu görüb lap havalandım. Heç sənin ağlamağını istəmirdim... Tez uşaqları çağırdım. Yenə hamımız başına yığışıb könlünü almaq istədik. Ruxum tar çaldı, Fərman nağara. Mən də oxudum. “Gecələr”i oxudum. Bu mahnını çox sevir Sitarə...”

...Rüxsarə bibim tez-tez nənəm üçün tar çalarmış. Nənəm rəhmətə gedəndən sonra bir dəfə də olsun tarı əlinə almayıb...

***

...Nənəm çarpayı dustağı olsa da, onun bir sözü iki olmayıb evdə. Əslində, ailəni o, idarə edib. Ailənin gəliri də onda olub. “Babamın gündəliyi” də bunu təsdiq edir.

“İş yoldaşlarım həftə sonu Göygölə gedəcəkdilər – dincəlməyə. Bunu evdəkilər də bilirdi. MƏN GETMƏK İSTƏMİRDİM. EVDƏ XƏSTƏ VAR. (yenə də seçim babamındır – S.C.) Şənbə günü hamı yığışdı. Fikrimdən dönmədim. Elə bu vaxt oğlum Arzuman gəldi. Sitarə plaşımı, bir də xərclik üçün pul göndərmişdi. ”Anam dedi ki, yoldaşlarından ayrılmasın, o da getsin...” Ah, Sitarəm...”

Həmin gün, bəlkə də, ömrünün ən gözəl gününü yaşayıb babam. Ona görə yox ki, iş yoldaşları ilə “yeyib-içməyə” gedib. Yox... Nənəmin qayğısı ona bir dünya sevinc verib...

...Nənəmlə babamın taleyi çox amansız davranıb onlarla. Çox!.. Bu, təsadüfdür, yoxsa... bilmirəm. Avqust ayı bu iki insanın ömründən paralel qırmızı-qara xətlə keçir. Nənəm avqustun 15-də anadan olub. Nənəmlə babam avqustun 12-də evləniblər. Nənəm avqustun 21-də qəzaya düşüb. Nənəm avqust ayının 26-da ana olub – Rüxsarə bibim doğulub. Nənəm avqustun 26-da, Rüxsarə bibimin ad günündə rəhmətə gedib. Avqust ayı nə istəyirmiş nənəmlə babamdan? Xeyirli və bəd günlər növbəyə düzülüb bu ayda. Bu qədər təsadüf ola bilməz, axı! Bəlkə, bu, taleyin, qədərin, qismətin ironiyasıdır...

**Babam o ağır illəri öz gündəliyində özünəməxsus şəkildə qeyd edib.**

“...Saatlar günə, sutkalar aya, aylar illərə döndü: bir il, iki il, beş il, on il, on altı il... Nəhayət, 16 il 5 gün. 5853 gün, 140 min 472 saat. Bu tarixlərin hamısı ürəkparam Ruxun adı ilə bağlıdır. İlk ilin – 366 günün əzablarını unutmaq mümkünmü? 24 saatlıq yaz, yay, payız, qış gecəsində şirin yuxu yatmayan bir uşağın vəziyyəti necə olar? Yastığımız taxta, yorğanımız, bəlkə də, olmadı. Sadəcə, mürgüləmək üçün başımızı Sitarəmin çarpayısının taxtasına söykədik...

Və... 21 avqust – bu gözlənilməz tarix, arzuedilməz gün çağırılmamış qonaq kimi gəldi. Qapının zəngini çalmadan evimizə girdi, özü ilə qəmqüssə, kədər gətirdi... Sitarəmi əbədilik apardı...”

**Nənəm rəhmətə gedəndə babam qadınlara qoşulub ağı da deyib, oxşayıb onu:**

*Yarı kaş görməyəydim,*
*Vəslin xoş görməyəydim.*
*Yardan qabaq öləydim,*
*Yerin boş görməyəydim....*

“Babamın gündəli”yində bir şeir də var: bilmirəm özü yazıb, yoxsa, kiminsə şeiridir, xoşuna gəlib, köçürüb gündəliyinə...

*Göz dikmişdi sənə bu ev, bu ocaq,*
*Üzünə baxmaqla olarmı doymaq?*
*Sən ki, bizimləsən, deyilsən qonaq,*
*Bağrı körpələrin al qandı, getmə.*

*Bilirsən, tapdandı gül bağım mənim,*
*Söndü ayım, günüm, çırağım mənim.*
*Yaman gündə səndin dayağım mənim,*
*Dur, məni başına dolandı, getmə.*

*Bütün aləm gülsə, gülmərəm sənsiz,*
*Bil ki, göz yaşımı silmərəm sənsiz.*
*Həyatın zövqünü bilmərəm sənsiz,*
*Göz yaşım dəryadı, ümmandı, getmə.*

*Sənin hər sözünə mən qulaq asdım,*
*İstəkli yarımsan, bağrıma basdım.*
*Adını qəlbimin qanıyla yazdım,*
*Əbədi ayrılıq amandı, getmə...*

**“Babamın gündəliyi” yenə “qan ağlayır”:**

“Sən öldün! Ümid də, arzu da səninlə öldü! Balalarını yox, məni də yetim qoydun. İndi uşaqların hamısının ağlı kəsir. Ruxumun üzünə baxa bilmirəm. Qarşımdakı o körpə Ruxum deyil daha. Mənim yaşıl gözlü körpə balam bu 16 ildə necə böyüyüb! Niyə heç fikir verməmişəm, İlahi! 30 yaşı var indi mənim dərd yoldaşımın! Amma o, birdən elə böyük, elə yaşlı göründü ki mənə! Sanki bu 16 ildə mənimlə birgə o da qocalıb! Bu 16 ildə evimizə gələn elçiləri geri qaytarmışdı Ruxum... Bu 16 ildə bir xeyir iş olmadı qapımızda, amma artıq uşaqların evlənmək, ərə getmək vaxtı idi. Sənin bir yaşında Esmiran, 3 yaşında Elmiran indi su sonası kimi gözəldilər. Ruxum onları elə böyütdü, elə tərbiyə etdi ki!..

...Səni son evinə yola saldıq. Özümü ələ ala bilmirdim. 16 il əvvəl bir dəfə səni yolundan döndərə bildim, səni 16 il saxlaya bildim. İndi aciz idim, çox aciz. Sanki ən böyük zərbəni də 16 il əvvəl yox, indi aldıq...

...Yanılmamışdım. Ən ağır günlərim indən sonra başladı. Əslində, fiziki ağrılardan qurtuldum, mənəvi ağrılarım birə-beş artdı. Sənsiz evimiz boş qaldı. Çarpayın boş qaldı. Səsin, nəfəsin göyə çəkildi. Həyat ikinci zərbəsini vurdu mənə. Nə qədər sağ idin, ağlamağa vaxtım olmadı. İndi səni ağlamağa vaxt o qədər çox ki...”

Babam gündəliyində dövlətin ona köməyindən, Səhiyyə nazirinin bir neçə dəfə bu ailədə olmasından, külfətin böyüklüyü və nənəmə lazımi dava-dərmanın alınması üçün təqaüd kəsilməsindən də yazır. Amma mənim məqsədim bunları yox, bir Azərbaycan kişisinin, bir ərin, bir atanın öz ailəsinin bütövlüyünü qorumaq, ömür dostunu yaşatmaq, balalarını sabaha daha layiqli ötürmək üçün çabalarından, min bir əzaba qatlaşmasından danışmaqdır...

Bir hadisə də yaddaşımı göynədir: nənəmin atası Əvəz kişi onun yasına gəlmir. Əslində, o dəhşətli qəzadan sonra bir dəfə də olsun babamgilin qapısını açmır. Ölənə qədər Sitarəyə görə bağışlamır özünü. “Mən balamı 16 il əvvəl öz əllərimlə öldürdüm” deyə Laçında acı göz yaşı tökür, qızına yas saxlayır...

“...Sonra sənsizliyə öyrəşdik. Sənsizliyin acısını bir də Ruxumu gəlin köçürəndə hiss etdim. Gözəl Ruxum gəlin köçürdü. Onun xoşbəxt olmağını o qədər çox istəyirdim ki. O, xoşbəxtliyə o qədər layiqdi ki....

*Gözəl qızın gəlin köçür, ay ana,*
*Nə yatmısan, məzarından qalxsana.*
*Kim alacaq, kim verəcək, bəs görən,*
*Ana payın o istəkli qızına.*

*Ata payı, qardaş payı şirindi,*
*Heç olarmı ana payı əvəzi.*
*Anasız qız köçürmək çətindi,*
*Bəs hardasan, özün yoxsan, ay ana...”*

Rüxsarə bibim ailə qurmağa da gecikir. Amma Allah bibimin qarşısına onu xoşbəxt edəcək gözəl bir insan çıxarır, sanki bununla mükafatlandırır onu...

Nənəmdən sonra Rüxsarə bibim heç vaxt öz ad gününü keçirməyib, ancaq anasının xatirə günlərini qeyd edib. Təkcə bu il ad günündə nəvələrini yığıbmış başına – onları küsdürməmək üçün...

Rüxsarə bibim ailədə öz missiyasını yenə davam etdirir: indi də bacı-qardaşları ona "ana" kimi baxır, hər bir işi onunla məsləhətləşirlər...

***

...Mən nənəmi görməmişəm. Şəklindən, atamın söhbətlərindən, "Babamın gündəliyi"ndən tanıyıram onu. Amma onu mənə sevdirən çox məqamlar var. Əvvəla, babamın sevgisi. Sonra, əzablı həyatı: 16 il ona dinclik verməyən fiziki ağrılardan qovrulub. Üstəlik, gözükölgəli olub ərinin, uşaqlarının yanında, onların qulluğunda dura bilməyib. Qonumdan-qonşudan, xeyirşərdən qalıb. Gəlin olub cərgələrə qoşulmayıb...

Mən həm də nənəmin adını daşıyıram. Nənəmdən sonra nəslimizdə qız uşağı doğulmayıb, bunu çox arzulayıblar. Əmilərimin, bibilərimin hərəsinin iki oğlu olub, Allah saxlasın. Mənim dünyaya gəlişim isə toy-bayrama dönüb. Ən çox sevinən babam olub, "sevgili Sitarə"sinin adını verib mənə. Hər dəfə alnımdan öpər, "Səni verən Allaha min şükür! Nənənin torpağı sanı yaşayasan, amma bəxtin onun bəxtinə oxşamasın!" deyərdi.

İndi də əmi-bibi uşaqlarından çoxu mənə "nənə" deyir, bu müraciət mənim üçün çox xoş olur...

***

...Gözəl babam! İndi başa düşürəm ki, bu dünyada necə tənha, necə yalqız olmusan! Heç biz də sənin nə qədər tənha olduğunu bilmədik, görmədik! Övladlarının əhatəsində olsan da, səni əzizləsələr də, nə qədər tənha bir ömür yaşadığının fərqinə varmadıq! Yalnız gündəliyini oxuyandan sonra anladım ki, bu həyatda necə tənha bir ömür yaşamısan! Amma ləyaqətlə yaşamısan! Ömrün "qurğuşun yükü" olub, amma sən bu yükü dəyanətlə çəkmisən! Polad iradənlə qəddar taleyini enmisən, ona qalib gəlmisən!

İnanıram: daha tək deyilsən, "sevgili Sitarə"nin yanındasan! Bu dünyada yalnız onun sevgisi ilə yaşadığın ömür-gün dostunun! Yeriniz cənnət olsun!..

***

...Babamın ömür yolu bir örnəkdir. Mən belə düşünürəm. Bu yazımla isə onu tərifləmək, yaxud kimlərəsə "dərs keçmək" fikrindən uzağam. Babamın tərifə ehtiyacı yoxdur, mənim də bu köhnə dünyaya dərs keçmək fik-

rim. Məqsədim bilirsinizmi, nədir? Dəyərlərin itdiyi bu qarmaqarışıq dünyada, bəlkə, kimsə bu yazıdan nəsə götürdü...

**Ağlıma:**

...həyat yoldaşını "baltalayan" ər gəlir!

...valideynlərinə əl qaldıran nadan övladlar gəlir!

...öz doğma ata-anasını qocalar evinə "bağışlayan"lar gəlir!

...sevdiyi qızı döyə-döyə saçını kəsən, yalvarışlarına baxmayaraq, bu acınacaqlı görüntünü telefonuna çəkən "oğlan" gəlir!



Mən bütün bunları bir də ona görə qələmə aldım ki, bu, bir Qarabağ xatirəsidir. Bu, təkcə bir ailənin qəlbləri göynədən həyat hekayəti, bir kişinin dəyanəti deyil, həm də Qarabağın yaddaşıdır. YADDAN ÇIXMAYAN QARABAĞIN YADDAŞI...

**Sitarə CABBARLI**

**PUBLİSİSTİKA**



**Məhərrəm QASIMLI,**
***professor***

## DAĞLARIN LAÇIN AŞIĞI

Hər dəfə aşıq Umbayı görəndə, onunla rastlaşıb əhvallaşanda elə bilirəm ki, o, indicə, bax elə bu səhər dağlardan enib gəlib. Səsindən, sözündən, yeriş-duruşundan dağların şehli-mehli havasını, ayna bulaqların duruluğunu, ərən palıdın, xan çinarın, qoca qartalın qürurunu qarşıma çıxardan bu ötkəm kişinin Ağcabədinin tərəkəmə çölündən-köhnə qışlaq yurdundan gəldiyinə heç cür inana bilmirəm. Laçın dağlarının bu laçın oğlu illər, on illər boyudur ki, canından əziz bildiyi doğma Laçınına həsrət qalsa da, onun Laçınsızlığına – başı ağ qarlı, sinəsi zümrüd meşəli axar-baxarlı dağlardan ayrı qaldığına nə özü inana bilmir, nə də bizlər – onu tanıyanlar. Çünki Laçın mahalı qayasından, daşından tozuna-torpağına, gülündən-çiçəyindən koluna-kosuna, kəkliyindən-bülbülündən sərçəsinə-sığırçınına qədər onun canında-qanında qərarlaşıb: danışır – səsində görünürlər, baxır – baxışından boylanır-

lar, susur – sükutundan lal qayalar-sal qayalar sıralanıb keçir. Səsinin-sözünün hər nöqtəsindən, hər zərrəsindən Laçın sevdası, daha doğrusu, Laçın yanğısı dikəlir. Mən bu məqamda "dikəlir" sözündən uyğun bir kəlmə tapa bilmədim, çünki aşıq Umbayın Laçın ağrısını ifadə edən yaralı ruhunu, pərişan, nisgilli əhvalını ahın-amanın, alovun-yanğının göyə dikəlməyindən başqa bir şeyə bənzətmək olmur:

*Sarı Aşığın məzarı oda düşüb əriyir,*
*Sultan bəyin ocağına yağı düşmən yeriyir.*
*Bu ömür, ömür deyil ki, can bədəndə çürüyür,*
*Taleyimizə yazılan yazımdan zəhləm gedir.*

Laçın havalı aşığın özünün-özünə üsyan qaldırdığı, qiyam elədiyi bu qara sevdalı məqamdan onun yarasının, ağrısının məlhəmi-dərmanı da boy göstərir:

*Adın nə şirindi, adına qurban,*
*Səcdəgahım, bir gümanım Laçındı.*
*Torpağı müqəddəs, suyu müqəddəs,*
*Qibləm, Kəbəm, Xorasanım Laçındı.*

*Həsrətindən sinəmə dağ çəkilib,*
*Qəmə tabe olub, qəddim bükülüb.*
*Ürəyimdə dərd toxumu əkilib,*
*Sağalmağa var dərmanım – Laçındı!*

Laçınlı aşıq Umbay ömrünün altmışını, yetmişini Laçınsızlıqda qarşılayıb. Ona sazlı-sözlü könül verən Laçın dağlarında məclis qurub qartallı qayalara, durnagözlü bulaqlara "sağ ol" demək isə hələ ki, göynəyən bir nisgil buludu kimi aşıq Umbayı dəli-divanə eləməkdədir... Aşıq Umbayın saza-sözə bağlılığı alın yazısıdır. 1940-cı ilin mübarək Novruz bayramı günündə dünyaya göz açan gündən sazın-sözün laylasıyla böyüyüb. Atası Sadıq kişi dini-ruhani təhsilli mömin bir adam olsa da, sazın-sözün vurğunu olub, aşıq dastanlarının çoxunu sinədəftər eləyən bu nurlu kişi övladlarının da könlünü saza kökləyib. Sadıq kişinin könlündən təkan alan Axundovlar tayfası az qala nəsilliklə saza-sözə bağlanıblar:

Umbay və Eynulla qardaşları ilə başlayan bu söz-sənət yolunu Ədalət davam etdirmiş, Elvin, Pərviz Axundovlar davam etdirir. Sadıq kişinin adını daşıyan nəvəsi – gözəl solo saz ifaçısı Sadıq Axundov aşıq Umbay oğlu da bu sənət şəcərəsinə daxildir. Bu gün nəsil şəbəkəsindən çox-çox uzaqlara yayılmış Aşıq Umbay sazının ardıcılları onlardır.

Umbay Axundov müxtəlif sahələr üzrə peşə təhsili alıb: əvvəlcə Şuşa Kənd Təsərrüfatı Texnikumunu, sonra Gəncədə Pedaqoji İnstitutunun tarix fakültəsini bitirmişdir. Ancaq sənət yolu, daha dəqiq desək, saz-söz sənətinə

vurğunluq onu aşıqlıq ünvanına gətirib. Dədə Şəmşir kimi böyük bir ustaddan xeyir-dua alandan sonra Mais Gəncəlinin yanında daha da püxtələşib. Neçə-neçə müsabiqənin, beynəlxalq festivalın iştirakçısı və mükafatçısı olub. Aşıq qurultaylarına dəvət edilib, idarə heyətinə üzv seçilib. Radionun, televiziyanın qızıl fondunda bir-birindən gözəl ifaları cəmləşib. Qardaşı oğlu rəhmətlik aşıq Ədalətlə birgə söylədikləri "Şah İsmayıl" dastanı Azərbaycan televiziyasında dönə-dönə tamaşaçı auditoriyasına çatdırılıb. Elə o vaxtdan da Azərbaycanın hər yerində ona "Şah İsmayılın aşığı" deyirlər. Bu, Aşıq Umbay sənətinə verilən böyük dəyərdir.



Bir el sənətkarı kimi onun səs-sorağı, şan-şöhrəti yetmişinci illərdən yayılmağa başlayıb, elin əziz aşığına çevrilib. Laçının el məclislərindən başlayan sənət şöhrəti Qarabağa, Gəncəbasara, Kəlbəcərə, Göyçəyə qədər yayılıb. Dədə Şəmşir, Hüseyn Cavan, İmran Həsənov, Əkbər Cəfərov, Ədalət Nəsibov kimi qüdrətli sənətkarlar onun ifaçılıq məharətini bəyənib, məclis aparmaq qabiliyyətinə, meydangirliyinə əhsən deyiblər. Aşıq Umbayı bir aşıq kimi səciyyələndirən özünəməxsus cəhətlər çoxdur: zil və şaqraq zəngüləli səsə malik olması, sinədəftərliyi, aydın, dolğun tələffüzü, oxusu-söylədiyi mətni təfərrüatlı şəkildə məclis əhlinə çatdırıb mənimsədə bilməsi, dastan ifaçılığında əsl aktyor məharəti nümayiş etdirməsi, Koroğlunun, Abbas Tufarqanlının, Qəribin, Şah İsmayılın, Kərəmin obrazını təkcə səsiylə, danışığıyla deyil, həm də üz-göz cizgiləri, yeriş-duruşu, bir sözlə hərəkət və davranış jestləri ilə çatdırmaq bacarığı, oxuduğu mahnının, çaldığı havanın ruhunu bütün varlığı və psixoloji əhvalı ilə təqdim etmək məharəti və s. Bütün bunlar hamısı bir yerdə onun öz obrazını – Aşıq Umbayın sənət portretini göz önündə canlandırır. Mən dəfələrlə müşahidə etmişəm ki, Aşıq Umbay dastan danışanda içərisində yaşadığı mühitdən, zamandan qopub uzaqlaşır, həmin dastanın dövrünə, zamanına, həmin hadisələrin baş verdiyi yerə, məkana yollanır. Baxıb görürsən ki, "Abbas-Gülgəz"i danışan aşıq on yeddinci yüzilliyə gedib çıxıb, quyuya salınan, imtahana çəkilən o özüdü. Əsl aşıqlıq, sənətə könüldən, candan bağlılıq elə budur! Oğulsansa, həmin məqamda Aşıq Umbayı dayandır, dastanın davamını danışmağa qoyma! Yaralanmış aslan kimi çıxacaq meydandan...

Gözəl ürəyi, saf qanı olmayan adamın gözəl şeir duyumu, incə saz duyumu ola bilməz. Ulu Tanrı Aşıq Umbaya saz-söz duyumu verəndə səxavətini əskik eləməyib. Bu səbəbdən də onun göz-könül gözəlliyini saz-söz

gözəlliyi tamamlayıb. Dastanlarımızın, aşıq şeirlərinin, saz havalarının dərindən bilicisi olan bu ustad sənətkar hər sözün, hər havanın üstündə doğma balasının üstündə əsirmiş kimi əsir, titrəyir. O, Qurbaninin, Abbas Tufarqanlının, Xəstə Qasımın, Sarı Aşığın, Dədə Ələsgərin, Dədə Şəmşirin, Mikayıl Azaflının sözlərini özünün sözləri kimi əziz tutur, xətirli saxlayır. Kimsə ustadların sözünü təhrif eləyəndə, yanlış oxuyanda özünə-sözünə sığmır. Heyif ki, aşıq Umbay həssaslığı indiki aşıqların çoxunda yoxdur:

*Çal aşıq, bu səsi duyum, ağlayım,*
*Barı heç olmasa, doyum, ağlayım.*
*Bu səsdəymiş əslim, soyum, ağlayım,*
*Ağlamaq bəmnəndi, orda zil olmur.*

Məhz belə ürəyin sahibi saz-söz sərrafı ola bilər. Ustadlar nəfəsini davam etdirib ustadlar cərgəsində dura bilər. Aşıq Umbayın qoşma gəraylılarını, təcnislərini, divanilərini, müxəmməslərini oxuduqca, bəstələdiyi “Sadığı” və “İşıqlı” havalarını dinlədikcə onun könül kövrəkliyi səni də sazın-sözün sirli-ovsunlu dünyasına çəkib aparır. “Laçın həsrəti” dastanı isə ustad aşığın könül hayqırtısı, saz-söz fəryadıdır. Bu dastanın onun dilindən eşidəndə dözüb-ağlamamaq, göz yaşında qərq olmamaq mümkün deyildir. Çünki Aşıq Umbay bu həsrət dastanının hər misrasında ancaq və ancaq Laçının obrazında çıxış edir, onun xəyalında öpüb oxşayır, səcdəsinə durur:

*Bərəkətdi Laçınımın torpağı,*
*Əziz saxlayırdıq orda qonağı.*
*Səbətin balıyla, nehrənin yağı,*
*Anamın süfrəsi çıxmır yadımdan.*

Xəlqi koloritin hər misrada özünəməxsus axar-baxarla dalğalandığı bu deyim tərzi gözəllik və kədərin, sevgi və həsrətin, qürur və nisgilin baş-başa verdiyi Aşıq Umbay qoşmalarının poetik ruhu üçün çox səciyyəvidir. Yaşın yetmişini adlayıb, səksənə-doxsana doğru gedən ustadı sazı-sözüylə baş-başa qoyub hələ ki, o qarlı-qubarlı dağlara sarı boylanmaqdan başqa əlimizdən bir şey gəlmir...

**AXTAR BABALARI**

## İBRAHİM MƏMMƏDOV



Məmmədov İbrahim İbrahim oğlu 1923-cü ildə Laçın rayonunun dilbər guşələrindən biri olan Oğuldərə kəndində dünyaya göz açmışdır. O, dünyaya göz açanda artıq atası 40 gün idi ki, dünyasını dəyişmişdi. Anasının, ata nənəsinin və dörd bacısının himayəsində böyümüşdü. Ata nənəsi Ağalar qızı Bacıxanım saf və kişi kimi sözübütöv bir qadın olub. Gözünün ağı-qarası olan tək oğlu öləndə mərd dayanaraq ağlayanlara təsəlli verib onları sakitləşdirmiş, "ağlaman, güman yerim var" – deyərək bir bayatı çağırmışdır:

*Ağlaman, naçar ağlaman,*
*Gün gəlib keçər, ağlaman.*
*Allah bağlanan qapını*
*Bir gün açar, ağlaman.*

Oğlunun qırxı günü yas yerinə gələn adamlara xəbər verirlər ki, İbrahimin oğlu oldu. Bu zaman Bacıxanım qarı yas yerinə gələn adamlara xəbərdarlıq edir ki, indiyə qədər ehsan yemisiniz, indi isə qurban kəsib toy çörəyi kimi yeyin. Nəvəsini yanına gətirtdirir, ona oğlu İbrahimin adını qoyur və hələ atasının yoxluğundan xəbərsiz uyuyan körpənin beşiyi başında belə bir bayatı deyir:

*Gözləri göyçək oğlan,*
*Top qarabirçək oğlan.*
*Bostanın dolu döymüş,*
*Tağında çiçək oğlan.*

...Beləcə illər ötüşür. İbrahim Məmmədov 1941-ci ildə Böyük Vətən müharibəsinə gedir. Gürcüstan SSR-nin Batumi, Suxumi şəhərlərində xidmət edir. Müharibə qurtarandan sonra evə qayıdanda artıq anası Hamayıl dünyasını dəyişmişdi. Evin bütün ağırlığı İbrahimin çiyinlərinə düşür. İş fəaliyyətinə sənətkar kimi başlayır. Oğuldərə və qonşu kəndlərdə işinin mahir ustası, halal bir sənətkar kimi tanınır.

Beş qız və iki oğul atası İbrahim kişi məlum hadisələrə qədər doğma kəndində yaşayır. 1992-ci ildə Ağcabədi rayonunun Səməd Vurğun kəndinin ərazisində, 2006-cı ildən isə Şəki rayonunun Cumakənd ərazisində məskunlaşır.

2009-cu ildə Laçın həsrəti ilə dünyadan köçən İbrahim İbrahim oğlunun qəbri Cumakənd ərazisində yerləşən Babaratma ziyarətgahındadır.

*Təqdim etdi:* **Vəliş ZİRVƏLİ**

**POEZİYA**



### Şəmsəddin QARAKEÇDİ

Həsənov Şəmsəddin Qəzənfər oğlu 1978-ci il mayın 5-də Laçın rayonunun Qarakeçdi kəndində anadan olub. Ürəyi yurd həsrəti ilə döyünən gənc poeziya həvəskarının bir neçə şeirini oxucularımıza təqdim edirik.

#### DAĞLARI

Xəyalıma gətirirəm hər gecə,
Qarış-qarış yoxlayıram dağları.
Uşaq kimi sığınıram qoynuna,
Anam kimi qoxlayıram dağları.

Dolanıram qayaların başına,
Dırmaşıram zirvələrin döşünə.
Dəm verirəm gözlərimin yaşına,
Hönkür-hönkür ağlayıram dağları.

Gah duman oluram, gah çiskin, gah çən,
Dəhşətdi, düzlərdə sürünürəm mən.
Şəmsəddin, qoy bilsin o yağı düşmən,
Ürəyimdə saxlayıram dağları.

#### LAYLA

Zülümüymüş, sitəmiymiş qaçqınlıq,
Girov qalan elim layla, a layla.
Dəstə-dəstə yağıların əlində
Tər bənövşəm, gülüm layla, a layla.

Həsrət çəkən Dəlidağım, Tərtərim –
Gözü yaşlı cərgələnən sədlərim.
Hönkür-hönkür qan ağlayan Həkərim,
Aşıb daşan selim layla, a layla.

Ürəyimin başı Laçın, Kəlbəcər,
Ər ellərim niyə düşdü dərbədər?
Ay Şəmsəddin, zülüm olmaz bu qədər,
Yanır dodaq, dilim layla, a layla.

#### BÜLBÜL

Mən yazığa bir nəğmə yaz,
Həzin-həzin oxu, bülbül.
Daşlar dözməz mən dözənə,
Torpaq olar çoxu, bülbül.

Niyə bəxtim gətirmədi,
Arzulara götürmədi.
Nə əkdimsə bitirmədi,
Qəbul etdim yoxu, bülbül.

Şəmsəddinəm, yurdum yoxdu,
Vətən dərdi məni yıxdı.
Bir gün bekar olan vaxtı
Mənə yuva toxu, bülbül.

**AXTAR BABALARI**

## MİR HEYDƏR AĞA



Kərbəlayı Mir Cabbar oğlu Mir Heydər ağa 1872-ci ildə Xırmanlar kəndində anadan olmuşdur. Mir Heydər ağa kəndin xanım-xatın gözəli, Mir Mədət ağanın qızı seyid Mahizər ilə evlənmişdir. Bu nikahdan onların 16 övladı dünyaya gəlmişdir. Onlardan 12-si (6 oğul, 6 qız) böyüyüb həddi-buluğa çatmış, ailə sahibi, hörmət, nüfuz sahibi olmuşlar. Mir Heydər ağa gözəl səsə malik idi. O, qəsidə deyəndə heç kəs özünü saxlaya bilməz, ağlayardı. Sovet hakimiyyəti qurulandan sonra başqa yerlərdə olduğu kimi Xırmanlar kəndinin də məscidini bağladılar və sonra da uçurub dağıtdılar. Ona görə də seyidlər dini mərasimləri keçirmək üçün çox vaxt Ağdam məscidinə gedirdilər.

Ağa Ağdam məscidinin axundu ilə çox yaxın idi. Hər il məhərrəmlikdə ömür-gün yoldaşı ilə axunda qonaq olardı. Məhərrəmlik qurtaranda gələrdilər. Mir Heydər ağa 1970-ci ildə dünyasını dəyişdi.

Böyük oğlu Əli müəllim bir il Pircahan kəndində Molla Musadan, bir il də kəndimizdə Seyid Əhəddən dərs almış və pedaqoji məktəb bitirmiş, ömrü boyu müəllim işləmişdi. Lakin dinini, imanını da qoruyub saxlamışdı. Namaz qılır, oruc tuturdu. Əli müəllim avazla Quran oxuyardı. Ağsaqqallar danışırdılar ki, bir dəfə Laçın şəhərində bizə yaxın bir adamın yasına getmişdik. Yas yerində Rayon Partiya Komitəsinin birinci katibi Xanlar Məmmədov da iştirak edirdi (rəhmətə gedən kişinin oğlu ilə bacanaq idi). Məclis əhli xahiş etdi ki, Əli müəllim bir surə Quran oxusun. Çox xahişdən sonra katib dedi ki, Əli müəllim, ağlına heç nə gətirmədən xahiş edirəm bir surə Quran oxuyasan. Bundan sonra Əli müəllim bir surə Quran oxudu. Hətta qadın məclisinin iştirakçıları da kişi mağarının qabağına toplaşmışdı. Seyid Əli Mir Heydər oğlu 1997-ci ildə Mərdəkan qəsəbəsində dünyasını dəyişdi. Mərdəkan qəbiristanlığında dəfn olunub.

Digər oğlanları Seyid Cabbar, Seyid İsmayıl, Seyid Mirsüca, Məhyəddin və Firəddin rayon camaatı arasında böyük nüfuza və hörmətə malik idilər. Seyid Cabbarın oğlu Zakir Cabbarov uzun müddət Laçın Rayon Təhsil Şöbəsində çalışmış, 1992-1994-cü illərdə Laçın Rayon İcra Hakimiyyətinin başçısı olmuşdur. Onun oğlu Elnur Cabbarov 1994-cü ilin dekabr ayında Cəbrayıl rayonunun Cocuq Mərcanlı kəndi uğrunda gedən döyüşlərdə şəhid olmuşdur.

Seyid İsmayıl müharibə illərində raykomda işləmiş, müharibədən sonra Ağdama köçmüş, orada müxtəlif vəzifələrdə çalışmışdır. Oğlanları Arzuman, Fərman, Arif, Mehman böyük hörmət sahibidirlər.

Qızları Xurşud, Suqra, Qüdrət, Nərgiz, Zərnigar və Şərqiyə dünyalarını dəyişiblər. Onların övladları müxtəlif işlərdə çalışır və böyük nüfuza malikdirlər. Qüdrətin böyük oğlu Rəhbər uzun müddət Laçın Rayon Polis Şöbəsində çalışmış, müharibə veteranı olmuşdur. Bir neçə il öncə qəflətən vəfat etmişdir. Kiçik oğlu Rəhim hüquq sahəsində çalışır. Ədalətli, vicdanlı, savadlı olmağı ilə seçilir və qanunun aliliyinə söykənərək cinayətkarlığa qarşı qətiyyətlə mübarizə aparır. Ümumiyyətlə, Mir Heydərin övladları, nəvələri, nəticələri bu ocağın adını ucaltmağa, hörmətini artırmağa, layiqli davamçıları olmağa çalışırlar.

## SEYİD ƏHƏD AĞA



Seyid Əhəd 1900-cü ildə Laçın rayonunda Yığın Seyidləri adlanan bölgənin Şəfilər kəndində məşhur din xadimi Seyid Əbdülrəhim kişinin ailəsində dünyaya göz açmışdır. Seyid Əhəd əvvəlcə atasından, sonra dövrünün savadlı din xadimi Molla Muxtardan dərs almış, öz bacarığı, zəkası, hafizəsi sayəsində dərin dini biliyə sahib olmuşdur. Seyid Əhəd o qədər şirin, səlis, əsaslı, tutarlı söhbət edərdi ki, bütün məclisdə olanlar ona qulaq kəsilərdilər, necə deyərlər, o olan məclisdə milçək vızıltısı eşidilərdi.

Eşitdiyimizə görə, ətraf kəndlərdən onun yanına xəstə gətirərdilər. Kitabı açıb bəzən deyərdi: bir şəfa duası yazıram, amma dualıq bir iş yoxdur, aparın həkimə və yaxud deyərdi ki, bunun duası Quranda yoxdur, aparın xaçpərəst keşişinə, bunun duası "İncil"dədir. Elə də edərdilər və həmin xəstə keşişin yanına gedəndən sonra sağalardı.

Bir dəfə qonşu Xəlfəli kəndindən 9 yaşlı bir qız uşağı gətirmişdilər, danışa bilmirdi. Seyid Əhəd ağa kitabı açıb bir-iki kəlmə yazmamışdı ki, qızın dili açıldı, danışdı. Onunla 20-yə qədər atlı gəlmişdi. Bunu görəndə ağlaşan kim, oynayan kim, ağanın əlindən, üzündən öpən kim, elə bir şadyanalıq yaşandı ki, gəl görəsən. Dedilər bu qız 9 ildir ki, danışmır. Aparmadığımız həkim qalmayıb.

Bir dəfə də qonşu kənddən bir havalı gəlin gətirmişdilər. Gəlin 4-5 saat mürgülədi, sonra ayılıb heç nə olmamış kimi şad-xürrəm çıxıb getdi. Ümumiyyətlə, Seyid Əhəd ağanın çox möcüzələri olub. O, 1965-ci ilin fevralında haqq dünyasına qovuşdu.

Seyid Əhəd ağanın oğlanları Seyid Yaqub, Seyid Yusif, Seyid İdris təkcə Laçında deyil, Qarabağda da böyük hörmət qazanıblar. Seyid Yaqubu bütün Laçın rayonu tanıyır, hörmət edirdi. Oğlu Vaqif də atasının adına layiq hörmət qazanıb. Şahin, Mirağa, Bünyamin də öz soy-köklərinə sadiqdirlər.

Seyid Yusif ağa uzun müddət maliyyə sahəsində çalışmış, işində məsuliyyəti ilə seçilmişdir. Oğlanları Nəbi, İlyas, Xıdır onun layiqli davamçılarıdır.

Laçın Rayon Baytarlıq İdarəsində çalışan Seyid İdrisə də bütün kəndlərdə həmişə hörmətlə yanaşıblar. O, 1990-cı ildə Xırmanlar kəndi ayrı kolxoz olandan sonra orada kolxoz sədri işləyib.

Ağanın kiçik oğlu Seyid Fazil hal-hazırda Xəzər rayonunun Qala qəsəbəsinin yeni massivində yaşayır, öz atasının yolunu ləyaqətlə davam etdirir.

Seyid Fazil Məşhədə gedib-gələndən sonra gecə yuxuda ona deyirlər ki, səhər duranda ərəb əlifbası ilə Quranı oxu. Heç bir təhsil görmədən Seyid Fazil ərəb əlifbasını sərbəst oxuyur. Hətta 10 il məktəbdə öyrəndiyi kiril əlifbası ilə kitab oxumaqda çətinlik çəkən onun kiçik oğlu Seyid Xaliq də ərəb əlifbası ilə Quran oxuyur. Namaz qılıb, oruc tutmaqla atasının, babasının yoluna sədaqətini göstərir.

Allah dünyasını dəyişən iman sahiblərinə rəhmət eləsin. Onların yoluna həmişə sadiq qalan insanların isə, necə deyərlər, imanları kamil olsun!

**Təqdim etdi: Azər CABBAROV**

**BİOQRAFİK TANITIM**

## CABBAROV MƏHYƏDDİN



Cabbarov Məhyəddin Heydər oğlu 1934-cü ilin yazında, güllü-çiçəkli bir ayda anadan olub. Uşaqlıq illəri çətin vaxta, İkinci Dünya müharibəsinin ağır günlərinə təsadüf edib. 1941-ci ildə Xırmanlar kənd 7 illik məktəbinin I sinfinə gedib. Yaxşı oxuduğu üçün II sinifdən III sinfə keçiriblər. VI sinifdə Qarabağa köçdüyünə görə sinifdə qalıb. 1949-cu ildə Xırmanlar kənd 7 illik məktəbini fərqlənmə ilə bitirərək Laçın Pedaqoji Texnikumunun I kursuna imtahansız qəbul olunub. O vaxtlar 4-5 qiymətlərlə oxuyan tələbələrə təqaüd verilirdi. Məhyəddin Cabbarov da 4-5 qiymətlərlə oxuduğu üçün texnikumu qurtarana qədər təqaüd alıb. 1953-cü ildə məktəbi müvəffəqiyyətlə başa vurduqdan sonra Ərdəşəvi ibtidai məktəbində əmək fəaliyyətinə başlayıb. İş fəaliyyətinin üçüncü ayında onu orduya göndəriblər. Estoniya respublikasının Tallin şəhərində XI Qızıl Ordu dəniz donanmasının quru qoşunları komandasında qul-

luq edib. İlk günlər Məhyəddin Cabbarovun bir müəllim kimi hörmətini saxlayıblar. Sonra yaxşı qulluq etdiyi, intizamlı, təlimlərdə fəal olduğu üçün komsomol təşkilatının rəhbərliyinə seçiblər. Sonra bölmə komandiri təyin ediblər. Serjant hazırlayan kursa göndərilib və qısa müddətdə ona kiçik serjant rütbəsi verilib. Zabitlik məktəbində oxumasını məsləhət görüblər. Bildiriblər ki, əgər məktəbi bitirib rütbə alsan vaxtından bir il qabaq ehtiyat zabit kimi evə buraxılacaq, imtahan verib zabit rütbəsi ala bilməsən bir il artıq qulluq edəcəksən. Bu təklifi qəbul edərək zabitlər məktəbini də bitirib və kiçik leytenant rütbəsi alıb. Orduda xidmətinin iki ilinin tamamına bir ay qalmış ehtiyat zabit kimi tərxis olunub, 1955-ci il oktyabrın axırında kəndə qayıdıb.

Əsgərlikdən gələndən sonra Novruzalılar (indiki Güləbird) məktəbində rus dili müəllimi, Zerti kənd ibtidai məktəbində rus dili müəllimi və nəhayət doğma kəndində rus dili müəllimi işləyib. Ailə qayğılarına başı qarışdığından uzun müddət ali təhsil ala bilməyib. Nəhayət 1965-ci ildə M.F.Axundov adına Rus dili və Ədəbiyyatı İnstitutunun (indiki Bakı Slavyan Universiteti) rus dili və ədəbiyyatı fakültəsinə qəbul olunub və 1971-ci ildə institutu bitirib.

1972-ci ildən məlum hadisələrə qədər Xırmanlar kənd natamam orta məktəbinin direktoru vəzifəsində çalışıb.

Laçının işğalından sonra Mərdəkan qəsəbəsində məskunlaşıb və orada köçkün şagirdlər üçün məktəb təşkil edib. 2007-ci ilin may ayına qədər həmin məktəbin direktoru işləyib. 2007-ci ildən təqaüdə çıxıb.

**MÜSAHİBƏ**

## "RUHƏN AZƏRBAYCANDA YAŞAYIRAM"



*Vətəndən uzaqda vətənlə yaşayanları, doğma el-oba nisgilini ürəyində gəzdirən laçınlıları axtarıb tapmaq, onlarla həmsöhbət olmağı qarşısına bir məqsəd kimi qoyan* ***lacin.info*** *saytının* ***"Qürbətdəki laçınlılar"*** *rubrikasının ilk qonağı, həmyerlimiz Söhrab İbrahimovdur. Uzun illərdir Azərbaycandan kənarda yaşamasına baxmayaraq, canıyla, qanıyla bu torpağa bağlı olduğunu deyir Söhrab müəllim.*

**Qısa arayış:** İbrahimov Söhrab Mədət oğlu 10 iyul 1974-cü ildə Laçın rayonunun Alıqulu kəndində anadan olub. 1991-ci ildə Pircahan kənd orta məktəbini bitirib. Elə həmin il ali təhsil almaq məqsədi ilə Rusiya Federasiyasının Yaroslavl vilayətinin Yaroslavl şəhərinə uz tutub. İlk əmək fəaliyyətinə Yaroslavl Şin zavodunda başlayıb. 1992-ci ildən sahibkarlıq fəaliyyəti ilə məşğul olur. 1997-ci ildə Beynəlxalq İqtisadiy-

yat və Hüquq İnstitutuna qəbul olunub. 2002-ci ildə həmin İnstitutun hüquq fakültəsinin "Dövlət idarəetməsi" ixtisasına yiyələnib.Yaroslavl şəhərində fəaliyyət göstərən "Vivat" firmasının hüquq məsləhətçisi vəzifəsində çalışır. 2007-ci ildən "Mila" firmasının direktorudur. 2009-cu ilin iyun ayından Ümumrusiya Azərbaycanlıları Konqresinin Yaroslavl şəhər şöbəsinin sədridir. 2009-cu ildən Rusiya Federasiyasının hakim partiyası "Yedinaya Rossiya" partiyasının üzvü, partiyanın ilkin dairələrindən birinin katibi, şəhər sovetinin siyasi bürosunun üzvüdür. Ailəlidir, 2 qızı və 1 oğlu var.

**– Söhrab müəllim, sizi ucqar dağ kəndindən böyük Rusiyaya aparan yola nəzər salaq...**

– Mənim Rusiyaya gəlişim 1991-ci ilə təsadüf edir. Həmin il Pircahan kənd orta məktəbini əla qiymətlərlə bitirib, ali məktəbə qəbul olunmaq üçün sənədlərimi Mirzə Fətəli Axundov adına Rus dili və Ədəbiyyatı İnstitutunun (indiki Bakı Slavyan Universiteti) rus dili və ədəbiyyatı fakültəsinə verdim. Ancaq qəbul ola bilmədim. Rus dilini mükəmməl öyrənmək və təhsil almaq məqsədi ilə Rusiya Federasiyasında yaşayan dayımın yanına getməyə qərar verdim. Elə o vaxtdan Yaroslavl şəhərində yaşayıram.

**– Uşaqlıq illərinzi necə xatırlayırsınız?**

– Orta məktəbdə oxuduğum illərdən məktəbimizdə keçirilən müxtəlif tədbirlərin fəal iştirakçısı idim. Səhnəciklərdə rollar alar, şeirlər söyləyərdim. Xatırlayıram ki, bir dəfə xalq mahnılarımızdan birini duet şəklində də oxumuşdum. Yeniyetməlik illərim Milli Dirçəliş Hərəkatına, azad, müstəqil dövlət yaradılması uğrunda gedən mübarizəyə təsadüf etdi. Öz yaşıdlarım kimi mən də bu mübarizəyə biganə qala bilməzdim. 20 Yanvar faciəsindən bir neçə gün sonra xalqımıza qarşı edilmiş vəhşiliklərə, haqsızlıqlara etiraz əlaməti olaraq komsomol biletindən imtina edən ilk şagird oldum. Daha sonra sinif yoldaşlarımızla birgə məktəbimizin o zamankı direktoru Əlövsət Abbasova müraciət edərək bizi yenicə yaradılan könüllü özünümüdafiə dəstələrinə göndərməyi xahiş etdik. Ancaq Əlövsət müəllim və dərs hissə müdiri bizimlə söhbət edərək təhsilimizi davam etdirməyi məsləhət gördülər. Lakin bizim istəyimiz yerdə qalmadı. O dövrlərdə Bakıda, Sumqayıtda komendant saatları yaradılmışdı. Laçında isə hər kəs öz kəndinin, obasının təhlükəsizliyini təmin etmək üçün kəndlərin girişində postlar qurmuşdular. Ov tüfəngləri ilə silahlanaraq növbə ilə qarovul çəkərdik. Yaxşı xatırlayıram, qarlı bir qış gecəsi yolu azaraq bizim kəndə gəlib çıxmış bir erməni maşınını saxladıq. Azərbaycan dilini bilmədiklərindən onlarla rus dilində anlaşmalı olduq. Bəlkə də uşaqlıq illərimdə gördüyüm pozulan insan hüquqları, xalqımıza qarşı edilən amansız hərəkətlər məni sonralar Beynəlxalq İqtisadiyyat və Hüquq İnstitutuna gətirib çıxartdı.

**– Laçın rayonunun işğalından 22 il keçir...**

– Çox çətindir... 22 ildir ki, Qarabağın, doğulduğum Laçın rayonunun həsrəti ilə yaşayıram. 22 il az bir zaman deyil, bu vaxt ərzində çox şeylər dəyişib. İnsanlar, həyat tərzi, iqtisadiyyat, texnologiya, bir sözlə hər şey. Ancaq dəyişməyən bir hiss var, o da Laçın sevgisi, Laçın həsrətidir. Baxma-



yaraq ki, Rusiya Federasiyasında yaşayıram, bu ölkənin vətəndaşlığını daşıyıram. Ancaq qanımla, canımla Azərbaycana bağlıyam. Cismən burada olsam da, ruhən Azərbaycanda yaşayıram. Hər an, hər dəqiqə ürəyim, fikrim Vətənimdədir. Bütün azərbaycanlılar kimi mən də Ali Baş Komandanımızın əmrini gözləyirəm. Nə vaxt bu əmr verilsə, tək mən yox, ətrafımda olan bütün insanlar torpaqlarımızın düşməndən azad olunması üçün canımızdan belə keçməyə hazırıq. Təki Laçına qayıdaq, Qarabağa qayıdaq. Əsir düşən torpaqlarımızın azadlığı, oğul, qız, qohum görüşünə həsrət qalan ata-babalarımızın məzarı bizdən bunu tələb edir. Biz buna nail olmalıyıq ki, gələcək nəsillərin qarşısına üzüağ, alnıaçıq çıxa bilək!

**– Laçını necə xatırlayırsınız?**

– Laçını xatırlamamaq mümkün deyil! Laçın bizim ürəyimizdir, silinməz xatirəmizdir. Doğulduğum Alıqulu kəndinin çox gözəl mənzərəsi var idi. Bəlkə də sözlə bunu təsvir edə bilmərəm. Əsrarəngiz təbiətə malik, kiçik, amma mədəniyyət, tarix baxımından böyük və qədim bir kənd idi. Min illik bir tarix yatırdı bizim kəndimizdə. Eramızdan əvvələ və orta əsrlərə aid çoxsaylı Alban abidələri var idi. Demək olar ki, yuxularımdan çıxmır gəzdiyim yerlər, tə-

biətinə heyran olduğum o kənd. Hər gün, hər an fikirləşirəm ki, geri qayıtsaq, orada qoyub gəldiyim ayaq izlərim, uşaqlıq xatirələrim yerində olacaqmı görəsən? Gözüyumulu tapa biləcəyim o yollar, cığırlar dururmu görəsən?

**– Yaşadığınız Yaroslavl şəhərində azərbaycanlılara qarşı münasibət necədir?**

– Bilirsiniz, münasibət zaman-zaman müxtəlif olub.Təbii ki, Sovet imperiyası dağıldıqdan sonra müstəqil dövlətlər yarandı. Əvvəllər dost, qardaş adı altında yaşayan insanlar öz müstəqil dövlətlərinin vətəndaşlığını qəbul etdilər. Əvvəlki münasibətlər tamamilə dəyişdi. Bu gün də münasibətlər birmənalı deyil. 1990-2000-ci illərlə müqayisədə çox şey dəyişib. Əvvəllər münasibətlər çox zaman aqressivlik, kobudluqla müşayiət olunurdu, hətta insan ölümünə gətirib çıxarırdı. Bəzən məsələləri araşdırıb, layiqli qiymətini vermək yolunda müxtəlif əngəllər olurdu. Məhz bir insan kimi, bir hüquqşünas kimi bu kimi hallara qarşı mübarizə üçün yaşadığım Yaroslavl vilayətində azərbaycanlılara kömək məqsədi ilə bir cəmiyyət yaratdım. 2009-cu il may ayının 5-dən Ümumrusiya Azərbaycanlıları Konqresinin Yaroslavl şəhər şöbəsinin sədri, iyun ayından isə regional şöbənin sədri seçildim. Hal-hazırda da bu vəzifəni daşıyıram. Bu məsuliyyətli vəzifəni mənə həvalə edən Yaroslavl şəhərində yaşayan bütün azərbaycanlılara öz minnətdarlığımı bildirirəm və onların ümidlərini doğrultmağa çalışıram.

**– Əhatənizdə laçınlı gənclər varmı?**

– Bəli, söhbətimin əvvəlində qeyd etdiyim kimi lap əvvəldən dayım burada yaşayır. Eyni zamanda onun böyük ailəsi ilə yanaşı, qardaşım və dayım oğlu da burada yaşayır, fəaliyyət göstərirlər. Artıq bu ailələr içərisində gənclər yetişir. Məqsədimiz budur ki, Vətəndən uzaqda olsaq belə, onları əsl azərbaycanlı, əsl laçınlı kimi yetişdirək. İnanıram ki, yaxın gələcəkdə bu gənclərlə bir yerdə əlimizdə qələbə şüarları tutaraq doğma torpaqlarımıza qayıdacağıq.

**– Azərbaycanla bağlı hansı tədbirləri həyata keçirirsiniz?**

– Çoxsaylı tədbirlərimiz olur. Azərbaycanla bağlı tədbirlərin keçirilməsi burada yaşayan gənclərimizin öz tarixini, mədəniyyətini öyrənməsi istiqamətində mühüm rol oynayır. Onların bu dəyərləri unutmaması üçün əlimizdən gələni edirik. Hər il 31 dekabr Dünya Azərbaycanlılarının Həmrəylik Gününü, 26 fevral Xocalı faciəsinin anım gününü, Novruz bayramını, 31 Mart Azərbaycanlıların Soyqırımı gününü, 28 May Müstəqillik Gününü, eləcə də işğal olunmuş rayonlarımızın anım günlərini xüsusi qeyd edirik. Bu tədbirlərdə nəinki azərbaycanlılar, başqa xalqların nümayəndələri də iştirak edir və onlara Azərbaycan həqiqətlərini çatdırırıq.

**Siyavuş ƏMİRLİ**

**POEZİYA**



**Yeganə İSMAYILQIZI,**
*Laçın rayonu, Qarıqışlaq kəndi*

## O GECƏ

***1992-ci il, 12 may gecəsi –***
***Cənnətimizi cəhənnəmə döndərən,***
***könlümüzə qara ləkə salan o gecə.***

Görməyənlər, gəlin sizə söyləyim,
Başımıza nələr gəldi o gecə.
Elə bil kükrədi bulanıq sular,
Göydən yerə leysan tökdü o gecə.

Bir qorxunc vahimə yayıldı elə,
Dedilər tez olun, kəndi tərk edin.
Laçın itirildi, Laçın satıldı,
Bu xəbər qəlbləri deşdi o gecə.

Evlər sahibsizdi, ocaqlar sönük,
Elə bil yuvadan uçurdu kəklik.
Gözlər dörd dolandı, başlar böyüdü,
Bilmədik hayana qaçaq o gecə.

Çevrildim, içəri baxdım bir anlıq,
Ev-eşik bəzəkli, güllər açılmış.
Titrədim, donuxdum, durdum bir anlıq,
Qəlbimin bir teli sındı o gecə.

Həsrətlə, kədərlə baxdım son dəfə,
Ayım, ilim keçmiş doğma evimə.
Elə bil əlvida deyirdi mənə
Min bəzək vurduğum evim o gecə.

Ana balasından xəbər tutmadı,
Qardaş bacısına əl uzatmadı.
Kimsənin harayı kimə çatmadı,
Namərdlik çağladı, coşdu o gecə.

İtlər bağda qaldı, toyuqlar hində,
Yada düşmədilər qaçqın selində.
Bax belə dərdlər də var ürəyimdə,
Tanrı da rəhmini kəsdi o gecə.

Aylar dolanacaq, illər ötəcək,
Tikanlar yerində güllər bitəcək.
Kimi görməyəcək, kimi görəcək,
Ancaq unudulmaz dağdı o gecə.

***1992-ci il.***



**KİMLƏR KEÇDİ BU DÜNYADAN**

## BİR MƏKTUBUN SORAĞIYLA – MƏHİ DAYIDAN XATİRƏLƏR



Laçın rayonunun füsunkar bir bölgəsində – Şəlvə dərəsinin Hacıxanlı kəndində Fətolar tirəsindən Məşədi Şaməmmədin nəvəsi, Gülməmmədin oğlu idi. Rəhmətlik ucaboy, geniş sinəli, bir sözlə, çox şəxsiyyətli adam idi. Mən onu uşaq vaxtlarımda görəndə həmişə gözümdə Koroğlu dastanında oxuduğum Giziroğlu Mustafa bəy canlanırdı, gənc yaşlarımda isə, onu xarakterinə görə "Böyük dayaq" romanındakı Rüstəm kişi obrazına bənzədirdim. O, atamın dayısı oğlu, Sərmayə mamamın (bibimin) həyat yoldaşı idi. Onu tez-tez gördüyümdən yaxından tanıyırdım. Hələ cavan yaşlarından Şəlvə dərəsində sanballı bir ağsaqqal kimi tanınmışdı. Rəhmətlik uşaqla-uşaq, böyüklə-böyük idi. Nədənsə uşaqlar da, böyüklər də – hamı onun məsləhətlərinə əməl edirdi.

1970-ci ilin payızı idi. Təsərrüfatı – mal-qoyunu qışdan çıxarmaq üçün köçüb aran Qarabağa – Lənbərana getmişdik. Lənbəranda Məhi dayının dostu Zakirin yatağında yurd salmışdıq. Bizim ailə idi, Məhi dayıgil, bir də Məhi dayının yaxın qohumu İdris dayının ailəsi. O vaxt 7 yaşım var idi. Mənim üçün yataq yeri çox maraqlı idi. İdris dayının böyük oğlu Akifin kiçik qardaşı Məmmədlə mənə düzəltdiyi "raqatka" (quşvuran) ilə gah yemxanaya toplaşan sığırçınları ovlayar, gah da qamışdan düzəltdiyi tütəyi çalardıq. Bir ay olardı belə xoş günlər keçirirdik, lakin bir gün Kamuna əmim dağdan – İmanlardan gəlib yatağa çıxdı. Axşam şam yeməyi zamanı dedi ki, gəlmişəm Rənanı – məndən böyük bacımı – aparam kəndə, qoy dərslərindən qalmasın, oxusun. Məhi dayı da gülümsəyə-gülümsəyə dedi ki, Rənanı bəlkə buyruq üçün aparırsan, əgər doğrudan da, təhsil üçün aparırsansa, Dilafəti apar, oğlan uşağıdır, o, məsləhətdir. Sabahısı gün Kamuna əmim məni o xoş günlərimdən ayırıb kəndimizə – İmanlara qaytardı.

Məhi dayı təhsil almamışdı, ancaq yazan olsa idi, sinəsində cild-cild kitablar yatırdı. O qədər dadlı, duzlu söhbətlər edərdi ki, dinləməkdən doy-

maq olmazdı. Hərdən sələflərindən – Laçın Eyvazdan, Şaməmməddən, Hidayətdən, hərdən də Laçının başqa bölgələrinin görkəmli şəxslərindən maraqlı söhbətlər açardı. Nəql edirdi ki, ötən əsrin əvvəllərində Laçının Seyidlər kəndində iki varlı kişi var imiş, birinin adı Ağalar, o birininki isə Muraz imiş. Ağalar səxavətli, Muraz isə bir qədər xəsis imiş. Ancaq Muraz daha varlı imiş, mal-qarasından əlavə bir dəstə də atı varmış. Yazda gətirib Şəlvə dərəsinin yaylaqlarına buraxar, yayda bir-iki dəfə gətirib duz verər, payızda isə yığıb Qarabağa apararmış. Murazın, həmçinin, bir dəstə qoyunu, 100-dən artıq da keçisi varmış. O, bir il payız vaxtı Qarabağa köçərkən Ağalara bildirir ki, keçilər Qarabağda yaxşı olmur, ona görə də xahiş edir ki, keçilərini qoşsun onun keçilərinə, bu il qalsın dağda, yazda gələndə hörmətindən çıxar. Ağalar razılaşır, Muraz kişi köçüb gedir. Elə ki, Muraz köçüb getdi, Ağalar əl atır bıçağa, tez-tez subay çəpişlərdən, dıvırlardan kəsib paylayır camaata, əsasən də Murazın kasıb qohumlarına.

Artıq mart ayı gələndə Muraz kişi bayram qabağı dağa, keçilərin vəziyyətilə tanış olmağa gəlir. O, kəndə çatanda birbaşa Ağalargilə gəlir, keçilərsə örüşdə imiş. Görüşəndən, hal-əhval tutandan sonra keçiləri soruşur. Ağalar deyir:

– Ay Muraz, bəs keçilərin subaylarına azar düşüb, çoxu (Ağalar artıq 100-dən 55-ni kəsmişdi) ölüb.

Muraz:

– Ola bilməz, ay Ağalar, subay keçi bu dağlarda heç vaxt ac qalmaz, nə də ölməz.

Ağalar deyir:

– Nə bilim, vallah, ay Muraz, özü də məəttəl qalmışam, çəpişlər bircə dəfə mə...ə...ə eləyir, o dəqiqə də yıxılıb ölür. Həmin dəqiqə kəsdin, kəsdin, kəsmədin haram olur. İndi axşam örüşdən gələndə özün də görərsən. Ağalar oğlunun qulağına nəsə pıçıldayır, sonra onlar keçirlər evə, söhbətlərini davam eləyirlər.

Axşam keçilər örüşdən gələn kimi, qəflətən çəpişin biri mə..ə...ə..! eləyib, bərkdən çığırır. Muraz da tez yerindən sıçrayıb çığırır ki: "ə...ə ..ə kəs! ə...ə kəs!!". Elə Ağaların oğluna da bu lazım idi, çəpişin qulağını ağzından çıxarıb, cibində gizlətdiyi bıçaqla boğazını siyirir. O vaxtlardan o bölgədə belə bir məsəl də formalaşmışdı: "Paşa bəy gördü getdi, Ağalar yedi getdi, Muraz bitəmənna getdi".

Köçkünlük dövrü Bərdə rayonunun Qaraqoyunlu kəndində məskunlaşmışdı. Ancaq rəhmətlik köçkünlüklə heç cür barışa bilmirdi. Deyiblər, dərd

dərd gətirər, elə də olmuşdu. Kişinin təsərrüfatını saxlayan ortancıl oğlu Zakir öz maşınında qəzaya düşüb həlak olmuş, baş qarışmış, bir sürü qoyunu da yiyəsiz qalıb pencər kimi qırılmışdı. Elə eşidirdim ki, xəstə yatır.

1993-cü ilin payızında Xızı dağlarına gəlmişdi. Necə deyərlər: "Füzuli dərd əlindən dağa çıxdı, dedilər bəxtəvər yaylağa çıxdı". O vaxt biz də Xızının Tıxlı kəndində məskunlaşmışdıq. Dörd gün bizdə qaldı. Tarixdən söhbət açıb, Sultan bəyin Zabux dərəsində erməni daşnaklarını necə darma-dağın etdiyindən, Hidayət, Səlim əmilərinin, atasının əmisi oğlanları Qocanın, Bəhramın erməni-müsəlman davasında Sultan bəyin yaxın silahdaşları olduğundan danışdı. Söylədi ki, Əlipaşa bəy (Sultan bəyin atası) babası Məşədi Şaməmmədi cavan vaxtı, hələ "bığ yeri tərləməmiş" yüzbaşı təyin edibmiş. Aralarında da həmişə yaxşı münasibət olmuşdur. Sonralar erməni davası başlayanda Şaməmməd Hacıxanlıda könüllülərdən ibarət bir dəstə toplayıb oğlu Hidayətin başçılığı altında Sultan bəyə köməyə göndərmişdi.



Məhi dayı Hidayət əmisi barəsində söhbət edib bildirdi ki: "Hidayət əmim Sibirə sürgün edilməmişdən əvvəl bir neçə gün Şuşada – Qala türməsində Laçının Kaha kəndindən olan Rza kişiylə bir yerdə yatıbmış. Mən böyüyəndə eşitdim və onlara getdim. Onlarda Rza kişiylə əmimin birgə şəkilləri də var idi. Çox söhbətdən sonra onlardan xahiş etdim ki, şəkli versinlər, aparıb üzünü çıxartdırım, böyütdürüm. Lakin Rzanın həyat yoldaşı heç cür razılaşmadı, dedi incimə, Rzamın yadigarıdı, verə bilmərəm. Çox təkiddən sonra, iki dostun şəklini qayçıyla kəsib bir-birindən araladı, Hidayət əmimin şəklini mənə verdi".

Məhi dayı atasının əmisi oğlu Eyvazov (Laçın Eyvazın nəvəsi) Kərim Məşədi Məmməd oğlunun 1937-ci ildə sovet hökuməti tərəfindən sürgün edildiyindən də söhbət etdi. Yeri gəlmişkən bildirim ki, Ziya Bünyadovun "Qırmızı terror" kitabını oxuyarkən 1937-ci lidə Hacıxanlıdan sürgün edilmiş bir qrup adamın – Məşədi Əhməd Məhərrəm oğlu, Qasım Məşədi Əhməd oğlu, Əli Məhərrəm oğlu, Bərxudar Əli oğlu, Əbdüləli Süleyman oğlu, o cümlədən də Eyvazov Kərim Məşədi Məmməd oğlunun sovet məmurlarının apardığı "cinayət" işləri ilə tanış olmuşam. Müstəntiq Eyvazov Kərim Məşədi Məmməd oğlundan soruşur:

– Müttəhim Eyvazov Kərim Məşədi Məmməd oğlu, sən mütəşəkkil dəstə təşkil edərək Sovet hökumətinə qarşı gizli iş aparmısan, tezliklə bu hökumətin devriləcəyini demisən, bunu təsdiq edirsənmi?

Kərim:

– Xeyr, yalandı.

Müstəntiq:

– Eyvazov Kərim Məşədi Məmməd oğluna Balta Qanadovun (ad şərtidir) ifadəsi oxunsun.

İfadə oxunur.

Müstəntiq:

– Eyvazov Kərim Məşədi Məmməd oğlu, buna nə deyirsən?

Kərim:

– Balta Qanadov yalan deyir.

O, dövrdə Qanadovun yalan, yaxud doğru deməsindən asılı olmayaraq, yazılı şəkildə verdiyi ifadə Eyvazov Kərim Məşədi Məmməd oğlunun gedərgəlməzə göndərilməsinə kifayət etmişdir.

Məhi dayı babasından belə bir əhvalat da danışdı. Kərbəlayı Rəsulla birlikdə Xankəndində bərbərə saqqallarına xətt vurdurmağa gedirlər. Onları erməni bərbərləri dalda bir evin zirzəmisinə aparırlar. Bu xoşagəlməz yerdən Məşədi Şaməmməd ayaq yolunu bəhanə edərək tez uzaqlaşır və gedib dövlət orqanlarına həmin şübhəli yerin yoxlanmasını xahiş edir. Bu arada getmək istəyən Kərbəlayı Rəsula mane olurlar, lakin yoldaşının qayıtmadığını görüb, onu buraxırlar. Dövlət məmurları gəlib həmin müəmmalı yerdə axtarış keçirərkən, binanın zirzəmisindən onlarla kəsilmiş müsəlman kəllələri tapırlar.

Məşədi Şaməmməd bilikli və çox nüfuzlu ağsaqqal imiş, onu eldən-elə ağsaqqallığa apararmışlar. Onun gedişinə ayrı-ayrılıqda yeddi qan bağışlanıb. Misal üçün, Bülövlük bəyləri arasında qan davasını yatırdığına görə aralarında möhkəm dostluq münasibətləri yaranıbmış. Həmin münasibətlərin Məcid müəllimlə Məhi dayı arasında davam etdirildiyinin şahidiyəm. Həm də Məşədi Şaməmməd dövrünün qayda-qanunlarını çox mükəmməl bilirmiş, vəkillik edərək bir çox günahsız həbs olunan adamlara bəraət qazandırıbmış. Yaxşı da natiqlik qabiliyyəti var imiş. Filologiya elmləri namizədi, misilsiz natiq Salman Salahov sağlığında Məhi dayının böyük oğlu Vahidə “Sən şeir söyləməkdə Şaməmməd dayıma çəkmisən” demişdi. Yeri gəlmişkən xatırladım ki, Şəlvə kəndində Həsənalılar nəslindən Məhi dayı ilə həmyaş, az yaş fərqi olan kişilər də – Həmzə, Baxşeyiş, Hüseynalı və başqaları ona “dayı” deyərdilər. Bir dəfə bunun səbəbini soruşanda gülümsəyib dedi:

"Bala, onların ata-babaları Fətoların bacısı uşaqları olub". Əlavə etdi ki, onlardan Baxşeyiş tarixi – nəsil şəcərəsini yaxşı bilir, özü də kiçik oğluna Laçın Eyvazın adını qoyub, o vaxt eşidəndə aparıb qapılarında bir erkək də kəsdim. Bərk də yeyib içəndilər. Sonra bildirdi ki, o vaxtlar Laçın Eyvazın bir bacısını da İmanlara ərə veriblər, Laçın Eyvaz da Laçıngüneyi cehiz kimi ona veribmiş. Ondan sonra İman uşağı o güneyin ətəyində kənd salıblar. İman uşağı qabaqlar Şəlvə çayının sağında, quzey tərəfdə – Palçıqlıdan yuxarı Sarıbulağın yaxınlığında olurmuşlar. Həmçinin bildirdi ki, İmanlar kəndindən Baxşalının (rəhmətə gedib) babası Baxşalı Laçın Eyvazın bacısı oğlu olub. Onun da igidliyindən söhbətlər etdi...

Məhi dayının babasının babası Fəto bir zamanlar, təqribən XVII əsrin sonlarında Dərələyəzdən Şəlvə dərəsinə gəlmiş, Hacıxanlı kəndində məskunlaşmışdır. Müharibəyə (1941-1945) qədər qohumlar arasında get-gəl olmuş, lakin müharibə illərindən əlaqə kəsilmişdir.

Məhi dayı sonra yenə mövzunu köçkünlükdən saldı. Gec-tez öz torpaqlarımıza qayıdacağımıza inandığını desə də, görürdüm ki, özünün səbri lap tükənib. Bir himə bənd idi ki, hönkür-hönkür ağlasın. Dedi: "Bala, Allaha şükür ki, camaat tələb edib, Heydər Əliyevi hakimiyyətə gətirdi, nə yolla olur-olsun, gec-tez torpaqlarımızı qaytaracaq. Ancaq nə bilim, ömür vəfa edəcəkmi o günü görüm? Bir arzum odur ki, torpaqlarımız alınsın, yaşlı adamam, gedib öz dədə-babalarımızın yatdığı torpağa qismət olum". "Məhi dayı, belə danışma, inşallah torpaqlarımız alınacaq, gedib o dağlarda yenə at oynadacaqsan" – dedim. Dediklərimi sanki eşitmədi, əlavə etdi ki, Dilafət, məktublarını mənə də oxudular, çox təsirləndim, gəldim (Nazibə bacımı da gətirmişdi) bir görüşək, pis zamandı, nə bilmək olar, aranın nə istisinə dözə bilirəm, nə suyunu içə bilirəm. Doğrusu, çox çətin vəziyyətə düşmüşdüm – qəhərləndim, ellərə nəsihət verən el ağsaqqalına nə deyəcəyimi bilmədim. Elə bil vəziyyətimi anladı və əlavə etdi ki, əgər başqa şeirlərin də varsa, oxuyasan qulaq asam.

Mənim kiçik bacım Məhi dayının kiçik oğlunun həyat yoldaşıdı, yəni gəlinidi. Bacıma və Məhi dayının böyük oğlu Vahidə (poeziya vurğunudur) bir-iki ay əvvəl şeir şəklində məktub yazmışdım. Görünür, məktubları Məhi dayıya da oxuyublarmış. Həmin şeirlərdən birini sizə də təqdim edirəm:

*Nazibə, nə vaxtdı sənin nazını*
*Eşidib görmürəm, darıxmışam mən.*
*Əzizim, nə vaxtdı qəm içindəyəm,*
*Fikirdən, xəyaldan yorulmuşam mən.*

*O ili ağaclar çiçək açınca,*
*Ayrılıq tufanı əsdi yamanca.*
*O vaxtdan köksümdə çalır kamança,*
*Vətən həsrətilə sızlamışam mən.*

*Hecoldu o qapı, necoldu o bağ,*
*Dağlar da kəfənə büründü dümağ.*
*O qızıl almandan qar qırıb budaq,*
*Hönkürüb yuxuda ağlamışam mən.*

*O körpə vaxtların çıxmır yadımdan,*
*Qovsam da getmirdin heç qucağımdan.*
*Dünyada bircə cüt qardaşlarından*
*Bilirəm küsmüsən, utanmışam mən.*

*Balalar balaca, özünsə gəncsən,*
*Hər gələn də deyir elə xəstəsən.*
*Ay bacım, dərdini gəl mənə ver sən,*
*Onsuz da dərd-qəmdən yoğrulmuşam mən.*

*Dünyada nə dövlət, nə var istərəm,*
*Ancaq öz yurduma cənnət deyirəm.*
*Darıxma əzizim, qürbətdi, gəlləm,*
*Kəndimdən ayrıyam, karıxmışam mən.*

Məhi dayıya bir neçə şeir oxudum: “Dağlar”, “Qoymayın” , “Qaldı” və s. Dinləyəndən sonra gördüm bərk kövrəlib. Bir qədər sükutdan sonra dedi ki: “Dilafət, çox qəmli yazırsan, mənim bu halıma da birini yazarsan”. Heç nə demədim, doğrusu, belə bir şəxsiyyəti, adlı-sanlı kişini tərənnüm etmək mənə çox çətin göründü.

O vaxt mən Xızının özündə Vergi Müfəttişliyində (vergilər şöbəsində) işləyirdim. Sabahı gün işə gedərkən, fikrini dağıtmaq üçün Məhi dayını da özümlə Xızıya apardım. Çox ünsiyyətcil adam idi. İdarəyə gələn Fındığan kənd icra nümayəndəsinin başçısı Fəridə xanımla bir qədər söhbətdən sonra onunla tanış çıxdılar. Sən demə, Fəridə xanım da Dərələyəzdən imiş. Məhi dayı Dərələyəzin Qovuşuq, Ayısəsi kəndlərindən köhnə adamların adlarını çəkdi, Fəridə xanım da onların adlarını eşitdiyini dedi. Sonra öz nəslindən, Laçın Eyvazdan, onun Dərələyəzdə daşqın vaxtı Arpaçayından tullanmasından danışdı. Fəridə xanım da eşitdiklərindən danışıb bildirdi ki, Laçın Eyvaz Arpaçayından tullandığı yerdə böyük bir daş təpəsi əmələ gəlmişdi. Belə ki, həmin yer itməsin, unudulmasın deyə, böyüklərin tapşırığı ilə hər yoldan – o yerdən keçən ora bir daş atmış, nəticədə təpə boyda böyük bir daş qalağı əmələ gəlmişdir.

Məhi dayı iki gündən sonra Bərdəyə qayıtmaq istəyəndə təkidlə iki gün də saxladım və təklif etdim ki, bəlkə köçüb bura gələsiniz, Dağlılar çox yaxşı adamlardı, yaltaqlıq, satqınlıq, oğurluq bilməzlər, həm də çox ədalətlidirlər. Dedi: “Eh!... oğul, qoyub gəlmək olur ki...”. Məhi dayı, mənimlə tay-tuş olmuş, lakin 1994-cü ildə öz maşınında qəzaya düşüb rəhmətə getmiş oğlunun məzarını nəzərdə tuturdu. Çox mütəəssir olduğumu duyub, başqa bir səbəb də göstərdi. Xızının təbiətini bəyənməmişdi. Dedi ki, nə aran kimi arandı, nə dağ kimi dağ. Tez-tez də havalar dəyişir – sərt küləklər əsir, mən də xəstə adam. Doğrudan da, Xızının təbiəti ilə insanları arasında bir təzad

var. Təbiəti nə qədər dəyişkən olsa da, insanları bir o qədər dözümlü, mərd, sözübütöv, qonaqpərvər olurlar.

Məhi dayı qayıdıb Bərdəyə gedəndən bir ay sonra ona nəzmlə yazdığım belə bir məktub göndərdim:

*Dinlədin şeirimi, kövrəldin bir az,*
*Dedin ki: "Mənə də götür birin yaz".*
*Heyif ki, həyatın şerimə sığmaz,*
*Gəzdirə bilərmi sətirlər səni?!*

*Söhbət etdin Sultan bəydən, Paşadan,*
*Ağalardan, bitəmənna Murazdan.*
*Nişanəsən Şaməmməddən, Eyvazdan,*
*Yadigar saxlasın əsrlər səni!*

*Bu fani dünyadan indi küsmüsən,*
*Sevinc becərmisən, kədər biçmisən.*
*Oğul itirmisən, qürbət görmüsən,*
*Oyaq qarşılayıb səhərlər səni.*

*Bircə dinlə bu arzumu, sözümü,*
*Bitəcək bu həsrət, üzmə özünü.*
*Yönəldib dağlara bir gün köçünü,*
*Yaman güldürəcək nəvələr səni.*

Heyif ki, Məhi dayı arzuladığımız o günü görə bilmədi. 1997-ci ildə rəhmətə gedib, elə yaşadıqları Qaraqoyunlu kəndinin qəbiristanlığında mərhum oğlunun sağ böyründə dəfn olundu.

Xəstə yatarkən bizi arzulayıb, gedib dəydik. Dedi ki: "bu yer bizə düşmədi, nə qədər ki, torpaqlarımız alınmayıb, yasımdan sonra bunları da (ailəsini) köçürüb yanınıza apararsız". Ona təskinlik vermək istədim: "Məhi dayı, nə danışırsan...". Sözümü kəsib dedi: "Yox bala, mən uşaq deyiləm".

Məhi dayının qırxı çıxandan sonra nə qədər təkid elədimsə də, oğlanları – Vahidlə Mehman – dedilər ki, biz atamızın, qardaşımızın qəbrini burada qoyub köçə bilmərik.

Rəhmətliyin ailə tərkibi aşağıdakı kimidir:



Həyat yoldaşı Sərmayə Miralı qızı, övladları: Vahid, Gülnaz, Zakir, Almaz, Kəmalə, Nəzakət, Nazilə, Mehman. Hamısı sağlığında ailə qurub ayrı yaşayırdı, özü kiçik oğlu Mehmanla qalmışdı. Vahidin iki oğlu, Gülnazın üç oğlu, Zakirin bir qız, bir oğlu, Almazın iki qızı, bir oğlu, Kəmalənin üç oğlu, bir qızı, Nəzakətin bir qız, bir oğlu, Nazilənin iki oğlu, Mehmanın da bir oğlu, bir qızı var. Oğlu da babasının adını daşıyır, deməli, Məhi dayı yaşayır.

**Dilafət RƏSULOV**

**POEZİYA**



**Yadigar HƏŞİMOV,**
*Laçın rayonu, Mişni kəndi*

## LAÇIN TƏRƏFƏ

Osman dostum, qəm eləmə, yolumuz
Düşər yenə üzü Laçın tərəfə.
Gün gələcək doğma yurda qovuşub,
Salacağıq izi Laçın tərəfə.

Düşsə də taqətdən tamam dizimiz,
İtirsə də öz nurunu gözümüz.
O ata yurdumuz, o yurd yerimiz
Yaman çəkir bizi Laçın tərəfə.

Dağlar oğlu, sərt şimşək ol çaxmağa,
Düşmənləri yandırmağa, yaxmağa.
Aşıb-daşan iti sel ol axmağa,
Dönək geci-tezi Laçın tərəfə.

Hər gəzini, gədiyini gəzmisən,
Hər gülünü, çiçəyini üzmüsən.
Neçə ildi həsrət çəkib dözmüsən
Baxa-baxa üzü Laçın tərəfə.

Hər düzündə, yamacında izin var,
İyirmi il həsrət çəkən gözün var.
Bilirəm ki, hələ möhkəm dizin var,
Yol eyləyər özü Laçın tərəfə.

Qəm yüküdür bu köçkünün şələsi,
Əriyibdir gözlərinin giləsi.
Yadigarın deyiləsi, deyəsi
Çoxdu hələ sözü Laçın tərəfə.

## HƏSRƏTƏM

Doğma yurdum, neçə ildir mən sənin
Torpağına, hər daşına həsrətəm.
Meh əsdikcə min naz ilə sayrışan
Gül-çiçəyin göz yaşına həsrətəm.

Gələmmirəm daha bağça-bağına,
Tamarzıyam yaylağına, dağına.
Həsədlə baxıram ötən çağına,
Enişinə, yoxuşuna həsrətəm.

Yurd-yuvasız kim olar ki, özündə?!
İstisi yox ocağın da, közün də.
Yamacında, çəmənində, düzündə
Çiçəklərin naxışına həsrətəm.

Qışın dizə çıxan qalın qarına,
Payızın xəzəlli saf sularına.
Yayda meşələrin talalarına,
Yazın narın yağışına həsrətəm.

Ay Yadigar, geri dönə oba, el,
Dəyə sənə Çalbayırdan əsən yel.
Bulud gələ, tökə leysan, axa sel,
Şimşəklərin çaxışına həsrətəm.

## O DAĞLAR KİMİ

Hanı o dağların tayı, əvəzi,
Mənə bir dağ göstər o dağlar kimi.
İtkin düşüb hər gədiyi, hər gəzi,
O vaxtdan qalmışam mən ağlar kimi.

Silinibdir cığırlardan izimiz,
Sönməkdədir ocağımız, közümüz.
Dikilibdir yollarına gözümüz,
Uzaqdan həsrətli qonaqlar kimi.

Solubdur yurdumun çiçəyi, gülü,
Olub başımıza dünyanın külü.
Qalmışıq çöllərdə boynu bükülü,
Atasız-anasız uşaqlar kimi.

Xəyalım bir anlıq dolandı kəndi,
Gah çıxdı dağlara, gah düzə yendi.
O məxmər çəmənlər solubdur indi,
Həsrətdən saralan yanaqlar kimi.

Xınalı kəkliyin xalından olmaz,
Kəkotu, qantəpər balından olmaz.
Yadigar, axtarma, bulaq tapılmaz
O dodaq göynədən bulaqlar kimi.

## İÇİMDƏ

Kövrək şeirlərin kövrəltdi məni,
Ağladım içimdə, yandım içimdə.
Özümü bir anlıq vətəndə gördüm,
Vətəni özümün sandım içimdə.

Hər sözün, hər misran bal kimi şirin,
İçdim şərbət kimi, qoymadım birin.
Nadanlar nə bilər hikmətin, sirrin,
Ən incə tellərin qandım içimdə.

Sis-dumanlı o dağlardan ötəri,
Diş göynədən bulaqlardan ötəri.
Çal-çağırlı yaylaqlardan ötəri
Çəkdiyin həsrəti andım içimdə.

Duydum hər misranda Laçın ağrısın,
O şair könlünün sonsuz qayğısın.
Görüb qəlbindəki vətən yanğısın
Öz həsrət yanğımı dandım içimdə.



**KİTAB RƏFİ**




## "DÜNYA, SALAMAT QAL..."

Bu kitab 2014-cü ilin yanvar ayında işıq üzü gördü. Təəssüf hissi ilə bildirməliyəm ki, çap etdirdiyi 6 kitabdan sonra həyata yenicə gəlmiş "Dünya, salamat qal..." adlı kitabını müəllif sağlığında görə bilmədi.

268 səhifəlik, nəfis tərtibatla "Yazıçı" nəşriyyatında işıq üzü görən bu kitabın redaktoru və ön söz əvəzi kimi qələmə aldığı 4 səhifədən ibarət olan yazının müəllifi Xətai Savalandır (müəllif Cabir Savalanın kiçik oğlu).

Bədii yaradıcılığa erkən başlayan, məktəbli ikən "Qızıl ulduz" adlı rayon qəzetində ilk şeirləri çap olunan Cabir Savalan sonralar bir sıra qəzet, jurnal və almanaxlarda dərc olunmağa başlayır. Bir sözlə, şairin şeirlərinin dövri mətbuatda işıqlanması ötən əsrin 70-ci illərinə təsadüf edir. O, 1989-cu ildən Azərbaycan Yazıçılar Birliyinin üzvü idi və yazdığı şeirlərinə görə müxtəlif mükafatlarla təltif olunmuşdu.

Bu gün ürək ağrısı ilə qeyd etməliyəm ki, (heç cür inana bilmirəm və dilim də gəlmir deməyə) Allaha olan sevgisini bütün sevgilərdən uca tutan və bu sevgini əksər şeirlərində dönə-dönə vurğulayan şair artıq bizlərlə deyil. Amma buna baxmayaraq, lirik şeirlər, qəzəllər və poemaların yer aldığı "Dünya, salamat qal..." adlı kitabını onu sevə-sevə oxuyan, poeziyasına böyük önəm verən oxucularına dəyərli töhfə, gözəl hədiyyə kimi mən də bir oxucu, qələm əhli olaraq yüksək qiymətləndirirəm.



Fikirlərimi burada tamamlayaraq, sonda bunu deməyi özümə borc bilirəm: "Yerin cənnətlik, ruhun isə şad olsun, şair!"

**Elnur MEHDİYEV**

**UĞURLU YOL**

**Osman ALIYEV**

## İLK XEYİR-DUA

Bu yaxınlarda Bərdədə qohumlarla görüşüb dərdləşirdik. Vaxtilə Laçında dərs dediyim məktəbdə xadimə işləyən Gülarə nənəmizlə söhbətimiz sözsüz ki, kənd xatirələri ilə dolu idi. Yaman kövrək olub, bir az da qocalıb mənim gözlərimdə. Mənə bir neçə misradan ibarət yazı göstərib, – nəvəmin yazısıdır, – dedi. Alıb oxudum. Doğrusunu deyim ki, heç üzünü belə görmədiyim müəllifin yazısı məndə xoş bir ovqat yaratdı. Nə yaxşı ki, gənclərimiz beləcə yaradıcılıqla, poeziya ilə yaşayırlar.



– Hələ yazıları çoxdur Ceyran balamızın, – dedi. Yəqin ki, nə vaxtsa o yazıları oxuyarsız. Mən də tənbəllik etməyib o yazını köçürdüm. Gənc bir tələbənin düşüncələri elə bilirəm ki, hamınız üçün maraqlı olar. İnşallah bu yazının ilk xeyir-duasını mən verirəm və inanıram ki, Ceyran Qurbanova imzası ilə tez-tez rastlaşacağıq.

**Ceyran QURBANOVA,**
*M.Ə.Sabir adına Pedaqoji Kollecin tələbəsi*

## MƏHƏBBƏT SEVGİSİ

İtirdik vüqarlı bir sənətkarı,
Ömrünün çiçəkli bir bahar çağı.
Çəkdi sinəmizə ayrılıq dağı,
Ağlatdı, sızlatdı, əzdi Məhəbbət,
Bizi ölümüylə üzdü Məhəbbət.

Həsrəti dağlardı, Laçındı onun,
Sinəsi qubardı haçandı onun.
Baxışı ildırım saçandı onun,
Alovdu, atəşdi, közdü Məhəbbət,
Bizi ölümüylə üzdü Məhəbbət.

Qəlbində gəzdirib acı həsrəti,
Düşmənə qəzəbi, kini, nifrəti.
Elinə hörməti, saf sədaqəti,
Daim ürəklərdə gəzdi Məhəbbət,
Bizi ölümüylə üzdü Məhəbbət.

“Laçınım” dönübdü ibadətgaha,
“Ay ilk məhəbbətim” səslənmir daha.
Döndərib özünü naləyə, aha,
Ölməzlik nəğməsi yazdı Məhəbbət,
Bizi ölümüylə üzdü Məhəbbət.

**ANIM**

## MƏRDANƏLİYİN VƏ KİŞİLİYİN ÜNVANI – MƏHƏBBƏT KAZIMOV



Bu yazını yazacağıma görə ilk öncə qoy bütün jurnalistlər bağışlasınlar məni. Yazdığım bu yazı Məhəbbət Kazımov kimi əsl kişilərə, mərdanə bir insana layiq olmadığına görə. Məhəbbət Kazımov haqqında hansısa bir neçə sətir yazmaq üçün əsl peşəkar jurnalist düşüncələri, jurnalist qələmi gərəkdir.

Oxuculara ünvanladığım bu yazını başqa ruhda, tamamilə özgə bir nəfəsdə yazmaq istəyirdim. Lakin "Sən saydığını say, gör fələk nə sayır" zərb-məsəlində olan fikirlərdən, sən demə, qaçmaq olmurmuş. Xəstələndiyi vaxtlarda Məhəbbət müəllimlə telefon söhbətlərim yadıma yana-yana düşür. Xeyli dərdləşəndən sonra "Məhəbbət müəllim, icazə versəydiniz sizdən kiçik bir yazı hazırlayardım" – dedim. "Nədən yazacaqsan, niyə yazacaqsan?" – soruşdu. "Elə-belə, düşüncələrimi, sizinlə bağlı duyğularımı sizi sevənlərlə bölüşmək istəyirəm".

Mənə elə gəldi ki, bu fikrimlə razılaşmadı. Nə bilim, bəlkə də mən yanılırdım...

Bütün ürəklərə yol tapan, özünəməxsus nəfəsi, səsi olan, min bir nəğmənin içindən ecazkar seçimi ilə fərqlənən, hamımızın fəxr etdiyimiz Məhəbbət Kazımovu kimlərəsə tanıtmaq fikrim yoxdur. İlahi yüksəklikləri, zirvələri fəth edən Məhəbbət Kazımovun bircə qartal baxışı, mərdanə bircə kəlmə tövsiyəsi şəxsən məndən ötrü fəxarət idi. Təkcə ona görə yox ki, bizim aramızda çox səmimi, mehriban, şirin bir münasibət olub. Bir də ona görə ki, mən Laçından çıxandan sonra Məhəbbət müəllimin duruşunda, baxışında, nəfəsində, mərdanəliyində, kişiliyində doğma Laçınımı tapdım. Məhəbbət müəllimlə ilk görüşümə qədər (bu görüş qohumum Şöhlət Abbasın təşəbbüsü ilə olub) elə bilirdim ki, Laçını heç kim mənim qədər sevə bilməz. Lakin Məhəbbət müəllimin Laçın sevgisi qarşısında öz fikrimdən daşındım.

Məhəbbət müəllimin bir mərdanəliyini də oxucularla bölüşmək istəyirəm. Yaxşı yadımda deyil, səhv etmirəmsə ya 2000-ci, ya da 2001-ci il idi. Telefonla məni Bakıya çağırdı. Evlərinə yaxın bir yerdə özünün istəyi ilə çay süfrəsi hazırlanmışdı. Masanın üstündə "Min bir mahnı" kitabı vardı. Məni çağırdığının səbəbini açıqladı: – "Eloğlu (Mənə Alıoğlu deyərdi həmişə), səni bu kitaba görə çağırmışam" – dedi. Sonra da qatladığı səhifəni

açıb mənə göstərdi: "Laçınım" mahnısının sözləri Məmməd Aslanın, musiqisi Məhəbbət Kazımovundur". – Bu kitabı mənə indi göndəriblər. Artıq 500 nüsxəsi hazırdır. Qalanını isə ayın sonunadək çap edəcəklər. Söhbətin nədən getdiyini əvvəlcə başa düşmədim. Mənim çaşqınlığımı görən Məhəbbət müəllim fikrini aydınlaşdırdı: – "Laçınım" mahnısının sözlərini sən yazmısan, yoxsa Məmməd Aslan? – sualı qarşısında qalmışam. Deyirəm bəlkə elə Məmməd müəllim yazıb, sənin şeirin ona oxşayır. Məhəbbət müəllimin fikri mənə aydın oldu. "Məmməd müəllim tanınmış şairimizdir. Nə çoxdur məni kimi cızma-qaraları olan müəlliflər" – dedim. Sonra daha aydın olsun deyə Məhəbbət müəllimdən Məmməd Aslanla telefon bağlantısı yaradılmasını xahiş etdim. Məhəbbət müəllim Məmməd Aslanla danışırdı. Baxışları, bütün varlığı elə bil nura boyandı. Məni qucaqlayıb sinəsinə sıxdı: – Elə də bilirdim. Məmməd Aslanın belə şeiri yoxdur, özü etiraf etdi.

Nəşriyyata zəng vurdu. "Min bir mahnı" kitabının çapının dayandırılmasını tapşırdı. Sonradan öyrəndim ki, əvvəl çap olunmuş 500 nüsxə kitabın da xərcini Məhəbbət müəllim ödəyib. Mənimçün təzə çap olunmuş bir kitab da hədiyyə etdi. Hər dəfə həmin səhifəni açanda qürur duyuram. Ona görə yox ki, "Laçınım" mahnısının sözlərini mən yazmışam, ona görə ki, mənim adım Məhəbbət Kazımovun adının yanındadır.

Bir fikrimi də bölüşmək istəyirəm oxucularla. Çox təkid elədim, xahiş etdim ki: "Məhəbbət müəllim, bu sözləri halallıqla sizə bağışlayıram. Mahnının sözləri də, musiqisi də sizin olsun. Bu sözlərə yanğını, odu, atəşi onsuz da siz vermisiniz".

"Yəni deyirsən ki, mən nakişilik edə bilərəm?" – deyən Məhəbbət Kazımov bir daha öz mərdanəliyini göstərdi.

Kitabımda olan şeirləri, ən çox da "Bu saçlarım ağarmasın, neyləsin" şeirini sevə-sevə dinləyərdi. Deyərdi ki, bu şeiri mənə yazmısan:

*Dostum, saçlarımın nə günahı var,*
*Onun Vətən dərdi, sonsuz ahı var.*
*Qəlbimin yurd adlı öz Allahı var,*
*Bu saçlarım ağarmasın neyləsin?*

*Söz gülləsi yandırmayan haram var?*
*Var-yoxumdan ümid adlı param var.*
*Ürəyimdə Laçın boyda yaram var,*
*Bu saçlarım ağarmasın neyləsin?*

*Gül-çiçəkli dağlar qoyub gəlmişəm,*
*Bulaqları çağlar qoyub gəlmişəm.*
*Həkərimi ağlar qoyub gəlmişəm,*
*Bu saçlarım ağarmasın neyləsin?*

*Zirvələrdə mən gördüyüm qar qalıb,*
*Qartal uçub o dağlardan, sar qalıb.*
*Osmana da nisgil adlı var qalıb,*
*Bu saçlarım ağarmasın neyləsin?*

Yaxşı yadımdadır, Məhəbbət Kazımovun 50 illik yubileyində istedadlı müğənnimiz Arif Laçınlı bu sözləri muğam üstündə dilləndirəndə Məhəbbət müəllimin göz yaşları hamımızı kövrəltmişdi.

Məhəbbət müəllimin ən ilahi keyfiyyətlərinin biri oxuduğu, bəstələdiyi mahnıların sözlərini sonalaya-sonalaya seçməsi, ən mənalı, qəlb oxşayan sözlərə müraciət etməsiydi. Məmməd Araz, Bəhmən Vətənoğlu, Sücaət, Mikayıl Azaflı, Məzahir Daşqın, Böyükkişi, Ramiz Qusarçaylı, Seyran Səxavət və sadalaya bilmədiyim söz xiridarlarına müraciət etməsi Məhəbbət Kazımovun mahnılarını uzunömürlü, sevilən, şirin, mənalı edib həmişə.

"Ay ilk məhəbbətim, son məhəbbətim", "Qurudub göndərmə bənövşələri", "Sən bir dəniz olaydın", "Bu oyunda kim uduzdu, kim uddu?" və sevilə-sevilə dinlənilən yüzlərlə mahnı Məhəbbət müəllimin qəlbinin dərinliklərindən süzülüb gəlib, minlərlə, milyonlarla ürəyi fəth edib, yaddaşlara köçərək yaşayıb və yaşayacaq.

27 yanvar 2014-cü il. Bu tarix bizlər üçün, Məhəbbətsevərlər üçün ən ağrılı bir tarixdir. Həmin gün təkcə insanlar yox, yarı yağış, yarı qar – göylərin yerə süzülən göz yaşları Məhəbbət Kazımovun aramızdan getməsinə ağlayırdı. Yanvar ayının 28-də Sizi arzuladığınız Laçına çatdıra bilməsək də, doğma Azərbaycanımızın hər şeydən çox istədiyiniz bir məzarlıq torpağına tapşırdıq. Yana-yana, inləyə-inləyə köz-köz olduq, yoxluğuna inanmadıq, yuxu olduğunu düşündük. Qarlı, şaxtalı havada Sizi son mənzilə yola salmağa nə qədər pərəstişkarınız gəlmişdi.

Uyuduğunuz yerdən ətrafa boylandım. Laçına oxşatdım buranı. Bütün ətraflar buradan çox-çox yaxşı görünür. Lap Laçında olduğu kimi. Siz hər zaman yüksəkliklərdə, ucalıqlarda olduğunuz kimi ucasınız. Hər şeydən çox sevdiyiniz vətən torpağının bu bir parçasında bir vətən də qazandınız, Məhəbbət müəllim – Laçın deyəcəm ona. Görüşünə həmişə, həmişə gələcəm. Çox sevdiyiniz bənövşə çiçəkləri ilə... O bənövşələrlə ki, hər zaman arzulayırdınız...



**Osman ALIYEV**

**PUBLİSİSTİKA**

## ERMƏNİLƏRİN QƏNİMİ LAÇINLI SEYİD HƏMİD

22 il əvvəl işğal olunmuş Laçın rayonunun ərazisi erməni quldur dəstələrinin hücumları zamanı sinələrini düşmən gülləsinə sipər etmiş laçınlı şəhidlərin, qazilərin qanı ilə suvarılıb. Bu torpaq bir çox igidlər, xalq qəhrəmanları yetirib.

Bu qəhrəmanlardan biri erməni quldur dəstələrinin Qarabağın dağlıq yaylasında qarşısının alınması, bu dəstələrin darmadağın edilməsində, onların doğma Qarabağa buraxılmamasında misilsiz şücaətlər göstərmiş, igidliyi haqqında əfsanələr dolaşan səhra komandiri Seyid Həmiddir.

Seyid Həmid 1875-1880-ci illərdə indiki Laçının Böyük Seyidlər kəndində anadan olmuşdu. Atası Seyid Hüseyn Mirizadə dövrünün fəalı, bütün Qarabağda və Zəngəzurda, Göyçədə, Vedibasarda nüfuzlu adamlarla sıx əlaqəsi olan hörmətli şəxsiyyətlərdən idi. Anası Seyid Pəri də bu regionda böyük hörmətə malik ruhani ailəsində doğulub.

Bütün bunlar Seyid Həmidin hələ gənc yaşlarından öz ailəsinin, tayfasının, kəndinin, sonra bütün mahalın təəssübkeşi, mərd, qeyrətli, doğulub böyüdüyü torpağı hər şeydən üstün tutan, əyilməz, mübariz bir şəxsiyyət kimi formalaşdırıb.

Böyük bir ərazidə – Qarabağın dağlıq hissəsində Seyid Həmid və onun ən yaxın dostları – erməni-müsəlman mübarizəsində son nəfəslərinə qədər bir-birlərinə sədaqətli olmuş Kosalarlı Mərdan, Sadınlarlı Kərbalayı Yusif oğlu Allahverdi yerli əhalinin problemlərinin həllində həmişə xalqın önündə olublar.

Bu 3 nəfərin maddi durumları və cəmiyyətdəki fəal mövqeləri güclü olduğundan yerli idarəetmə orqanlarının, Gorus və Şuşa qəzalarının rəhbərləri regionda müəyyən məsələlərin həllində, həyata keçirilməsində onlarla hesablaşmalı olurdular.

Seyid Həmid molla yanında ibtidai təhsil almışdı. Seyid Həmidin ağsaqqallıq, rəhbərlik bacarığı, igidliyi 1918-1920-ci illərdə erməni quldur dəstələrinin Zəngəzura, Qarabağın dağlıq hissəsinə basqınları zamanı meydana çıxdı. Burada bir faktı qeyd etmək lazımdır ki, Seyid Həmid Hüseynqulu bəyin qızı İpək xanımla evlənmişdi. İpək xanım Seyid Həmidin sədaqətli həyat yoldaşı olmaqla yanaşı, bir bəy qızı kimi də onun formalaşmasında mühüm rol oynamışdı.

Ona görə də Seyid Həmid Azərbaycan milli burjuaziyasının nümayəndəsi kimi doğma torpağının çılğın, mübariz, dönməz müdafiəçisinə çevrilmişdi.

1918-ci ildə türklərsiz Qafqaz siyasətinin müəllifləri və rəhbərləri tərəfindən təpədən dırnağa qədər silahlandırılmış erməni quldur dəstələri əvvəlcə Göyçə mahalının, Zəngəzurun azəri türkləri yaşayan kəndlərinə basqınlar etmiş, onları misli görünməmiş qəddarlıqla, qadına, körpə uşaqlara rəhm etmədən qətlə yetirməklə qədim türk torpaqları olan Ağbaba, Qəmərli, Dərələyəz mahallarından qovub çıxarmış, döyüşlər indiki Laçın rayonunun ərazisi yaxınlığında Gorusun türklər yaşayan Bayandur, Xənəzək, Xaznavar kəndlərini əhatə etməyə başlamışdı.

Lakin hiyləgər erməni terrorbaşları Qarabağı ələ keçirməyin heç də asan olmayacağını bilərək fitnəyə, hiyləgərliyə əl atdılar. Onlar Sultan bəydən Zabux və Abdallar dərələrindən keçərək Şuşaya, Aran Qarabağa keçməyi xahiş edirlər. Bu haqda çox danışıldığından təkrarçılığa yol vermək istəmirik. Məlumdur ki, Sultan bəy ağıllı hərəkət edərək qardaşı Xosrov bəylə birlikdə qardaş Türkiyədən hərbi zabitlər gətirdərək erməniləri, daha dəqiq türkün qəddar düşməni olan Andranikin terrorçu quldur dəstəsini, silahlı hərbi birləşmələrini Zabux dərəsində məhv etmişdi. Lakin buna qədər çox hadisələr baş vermişdi.

Ermənilər ayrı-ayrı kəndlərə soxularaq yanğınlar törədir, əllərinə düşən müsəlmanları xof yaratmaq üçün qəddarcasına qətlə yetirirdilər. Vəziyyət o dərəcəyə çatmışdı ki, Sultan bəy Pircahan kəndinə qədər dinc əhalini Qırxqızdan keçirməklə Aran Qarabağa köçürmək qərarına gəlir. Lakin elə həmin vaxt çaparlar bəyə xəbər gətirirlər ki, Seyid Həmid, Cağazurlu Ağaməmməd (Ağamməd) və Hacılarlı Ağalar erməni quldur dəstələrini Minkənd çay hövzəsindən qovub çıxarıb və Sultan bəyə xəbər göndəriblər ki, heç kəs kəndlərindən, evlərindən tərpənməsin, erməniləri bu torpaqlara buraxmayacaqlar.

Bu məqamda qeyd etmək lazımdır ki, həmin hadisələr ərəfəsində Sultan bəy özü Seyid Həmidi görüşə dəvət etmiş və bildirmişdi ki, indi bizim bir düşmənimiz var, o da murdar ermənilərdir. Ona görə də aramızda olan bütün narazılıqları bir kənara qoyub düşməni bu torpaqlara buraxmamalıyıq.

Həmin görüşdə Seyid Həmid Sultan bəydən arxa kəndlərdə əmin-amanlığı təmin etməyi və özünə, Cağazurlu Ağamməddə və Hacılarlı Ağalara hərbi əməliyyatları uğurlu başa vurmaq üçün xüsusi səlahiyyətlər verilməsinə köməklik göstərməsini xahiş edir. Bundan sonra Seyid Həmid faktiki olaraq indiki Laçin rayonunun ərazisində Azərbaycan hərbi birləşmələrinin rəhbəri olur.

Bu zaman heç bir mülki və hərbi təhsili olmayan Seyid Həmidin hərbi istedadı üzə çıxır.

Zabux dərəsində Andranikin quldur dəstəsi darmadağın edildikdən sonra Sultan bəyin qardaşı Xosrov bəyin Türkiyədən dəvət etdiyi türk zabiti

ərazini gəzib öyrəndikdən sonra Sultan bəyə və Seyid Həmidə tövsiyə edir ki, nə qədər kiçik Qafqazın ən hündür zirvəsi olan, dəniz səviyyəsindən 3500 metr yüksəklikdə yerləşən Qaragöl yaylağı, Keçəl dağ, Boz dağ, Çeyil düzü sizin – yəni Azarbaycanın əlində deyil, bu torpaq erməni terrorçularının hücumlarından sığortalanmır. Çünki Qaragöl hərbi-strateji cəhətdən elə bir mühüm nöqtədə yerləşir ki, Qərbdə bütün Vedibasar, bütün Arazboyu Naxçıvan, cənubda bütün Dağlıq və Aran Qarabağ, cənub-qərbdə Gəncəbasar ovuc içi kimi görünür.

Beləcə Seyid Həmid yerli əhalidən ibarət olan hərbi dəstələrlə erməni quldur dəstələrini Minkənddən başlamış bütün Həkəri çayı boyunca hücuma keçərək darmadağın edir, onların yerli azəri türklərini kütləvi şəkildə qətlə yetirmələrinin qarşısını alır. İlk ağır döyüşlər Əhmədli, Sadınlar, Hacılar, Malıbəy kəndilərini əhatə edən ərazidə baş vermiş və Seyid Həmid Cağazurlu Ağamməd, Hacılarlı Ağalar, Malılbəyli Zaman və digər silahdaşları ilə birlikdə 1918-ci ilin iyun-sentyabr ayları ərzində erməni terror dəstələrini qədim türk torpaqları olan, sonradan İrandan, Türkiyədən köçürülmüş ermənilərin zorla yerləşdirildikləri Xoznavar, Bayandur dərəsindən, Qurban bulağından, Buzovçu, Məscid dərəsindən, Eşşək meydanından vurub çıxarmışdı.

Ən şiddətli və ağır döyüş köhnə Gorusda, Gorus dərəsinin Qaragöl istiqamətindəki baş hissəsində getmişdi. Seyid Həmidin rəhbərliyi altında bu dövrdə baş vermiş bütün döyüş əməliyyatları uğurla başa çatmış, Azərbaycan hərbi birləşmələri onun rəhbərliyi altında Gorus kəndinin şimalındakı Ayı dərəsinin son aşırımından İşıqlı dağının qərbindən, Çeyil düzündən keçərək döyüşləri müvəffəqiyyətlə başa çatdırmış, erməni quldur dəstələrini indiki Laçın rayonu ərazisindən qovub çıxarmışdı.

Qaragöl döyüşləri başa çatdıqdan sonra ermənilər bu əraziyə soxulmağa bir daha cürət etməmiş, Sultan bəyin böyük maddi və mənəvi dəstəyi, Seyid Həmidin igidliyi, qoçaqlığı, cəsarəti, komandirlik qabiliyyəti bu ərazidə əmin-amanlıq yaratmışdı. Azərbaycanda Sovet hakimiyyəti qurulduqdan sonra Azərbaycan SSR ilə Ermənistan SSR arasında sərhəd müəyyən edilərkən, məhz Seyid Həmidin başçılığı altında qəhrəman azəri oğullarının azad etdiyi ərazilər, o cümlədən Azərbaycan üçün mühüm hərbi strateji əhəmiyyət kəsb edən Qaragöl yaylağı, İşıqlı dağı Azərbaycanın tərkibinə daxil edildi.

1924-cü ildə Laçın rayonu təşkil olunarkən yerli və mərkəzi Bakı hakimiyyəti Seyid Həmidə hörmətlə yanaşmış, ona Pircahan Şurasının sədr müavini vəzifəsini etibar etmışdi.

Lakin ermənilər Seyid Həmidin qaniçən, başkəsən, quldur olması, yüzlərlə günahsız erməni uşaqlarını, qadınlarını qətlə yetirməsi haqqında Moskvaya, İttifaq hökumətinə ardı-arası kəsilmədən şikayətlər yazmış, onun həb-

sinə nail olmaq üçün dəridən-qabıqdan çıxmışdılar. Ona görə də Seyid Həmid 15 ilə yaxın qaçaqlıq həyatı yaşamış, yerli əhali igid, qəhrəman oğlunu gizlətmiş, onu göz bəbəyi kimi qorumuşdu. Seyid Həmid tədbirli adam idi. Dövlət orqanlarına təslim olmaq istəyirdi, lakin Moskvadan rəsmi qərar qəbul edilmişdi ki, Seyid Həmid tutularaq Azərbaycana, Laçın hüquq-mühafizə orqanlarına deyil, Ermənistana – Gorus rayonuna təhvil verilsin. Ona görə də o, qaçaqlıq həyatı yaşamağa məhkum idi.

Lakin mənfur düşmən min bir fitnə, hiylə ilə yerli bədxahlardan, sapı özümüzdən olan baltalardan birini ələ almış, o da 1934-cü ildə arxadan atəş açmaqla Seyid Həmidi əyilib bulaqdan su içərkən indiki Laçın rayonunun Fingə kəndi yaxınlığında xaincəsinə qətlə yetirmişdi. Burada qeyd etmək lazımdır ki, Seyid Həmidi xaincəsinə qətlə yetirən əslən Laçından olmayıb.

Seyid Həmid xalqımızının böyük şəxsiyyətlərindən biridir. Bu azadlıq mücadiləsində Seyid Həmid Abbasqulu bəy Şadlinski, Güney Azərbaycanda Kazımxan kimi xalq qəhrəmanları ilə bir sırada durur. Ermənilərin təbliğatına züy tutan bəzi yerli bədxahların o vaxtlar dedikləri kimi, Seyid Həmid başkəsən, quldur, qaniçən olmayıb. O, öz doğma torpağını, doğma elini yağı düşmənlərdən qoruyan bir qəhrəman, namus, qeyrət rəmzi, eyni zamanda erməni qaniçənlərinə qarşı barışmaz və amansız bir igid idi.

Seyid Həmidin ömrü müharibədə, savaşda keçdiyindən, özü və ailəsi ilə məşğul olmağa vaxtı olmamışdı. Onun cəmi 2 övladı olmuşdu: Muxtar və Mirəli. Muxtar 2 yaşında dünyasını dəyişmişdi. Babasının adını daşıyan Mirəli isə 1937-ci ilin repressiyasından qurtarmaq üçün adını belə dəyişmək məcburiyyətində qalmışdı. Miriş (Mirəli) Hüseynov öz həyatını elmə həsr etmiş, Azərbaycan Milli Elmlər Akademiyasının Sumqayıt filialında kimya elmləri namizədi kimi elmi işlə məşğul olmuşdu.

Hal-hazırda təqaüdçüdür. Onun övladları Yaşar və Elşən mühəndis, qızları Sevil həkim, Sevda ingilis dili müəllimi, eyni zamanda konservatoriyanın məzunudur. Babasının adını fəxarətlə daşıyan Seyid Həmid sabiq polis işçisidir.

Aradan uzun illər keçsə də, hal-hazırda da Laçınsız yaşayan bütün laçınlılar əfsanəvi səhra komandiri, qəhrəman oğul Seyid Həmidi özlərinin xilaskarı kimi fəxrlə xatırlayır.

Seyid Həmid heç vaxt unudulmayacaq və xalqımızın müqəddəs azadlıq mübarizəsi tarixində daim layiqli yer tutacaq.

**Elçin HƏSƏNOV**

**POEZİYA**



**Solmaz CAHANGİROVA**

## BAXMA

Gözlərin ömür şamı,
Yanır vüsal axşamı.
Tələsmə, iç bu camı,
Saata baxma, baxma.

Zaman itə nə ola,
Huşum gedə, nə ola.
Qoynumda ocaq qala,
Saata baxma, baxma.

Kirpiklərin düzümü,
Aldı məndən dözümü.
Qoy üzümə üzünü,
Saata baxma, baxma.

Yorğadır bəxt atımız,
Gecə toy-büsatımız.
Ay bizim saatımız,
Saata baxma, baxma.

Saatlar üzər səni,
Artırar qəm-qüssəni.
Gözləsən Hilaləni,
Saata baxma, baxma.

***1981***

## ALLAH, MƏNİ EŞQ APARDI

Saranı sellər apardı,
Leylini dillər apardı.
Nə sel idi, nə dil idi,
Allah, məni eşq apardı.

İnsafı, amanı yoxmuş,
Dönməyə gümanı yoxmuş.
Vaxtı yox, zamanı yoxmuş,
Allah, məni eşq apardı.

Onda gördüm ölümümü,
Döndərə bilsəm yönümü.
Qara eyləməz günümü,
Allah, məni eşq apardı.

İçim içindən söküldü,
Sökülüb eşqə töküldü.
Bəs dözüm hara əkildi? –
Allah, məni eşq apardı.

Atəş saçdı gözlərimə,
Qüvvət verdi dizlərimə.
Ləpirçidir izlərimə,
Allah, məni eşq apardı.

Ən qorxulu qarğış imiş,
Ən ləzzətli alqış imiş.
Ruhumuza naxış imiş,
Allah, məni eşq apardı....

***13.02.2014***

**NÖQTƏ**

Nöqtə qoydum sənli günə,
Təəssüflü, qəmli günə.
Sonda heyrət qaldı mənə,
Sevgi yolu sənlik deyil.

Yonulmamış, cilasızsan,
Qalayçısan, qalaysızsan.
Duyğusuzsan, anlamsızsan,
Sevgi yolu sənlik deyil.

Nəyi pozub, nəyi yazsan,
Nə fərqi var, anlamazsan.
Yerində qal harda azsan,
Sevgi yolu sənlik deyil.

***13.02.2014***

**BƏLKƏ HİRSİM SOYUYA**

Sənin sakitliyindən üstümə kölgə düşə,
Üstümə kölgə düşə, bəlkə hirsim soyuya.
Mülayim baxışınla bu qəzəbim döyüşə,
Döyüşə, halsız düşə, bəlkə hirsim soyuya.

Alışıb yanan üzüm toxuna yanağına,
Suya minnətçi gələ dodağım dodağına.
Ömürlük qandal vuraq həsrətin ayağına,
Xain gözə ağ düşə, bəlkə hirsim soyuya.

Bircə günlük həsrətdə yanan səbirsizliyim,
Bu yaşımda yaşınla ölçülən ayım, ilim.
Boy atıb böyüdüyüm şəhərdə qəribliyim
Qoynunda məskənləşə, bəlkə hirsim soyuya.

Gör bir günlük həsrətin nə günə qoydu məni,
Yığdı könül qışıma həsrət azuqəsini.
Danış, dindir könlümü, qoy eşidim səsini,
Könlümə haray düşə, bəlkə hirsim soyuya.

İstehzadan, qeybətdən nə qorxaq, nə qəm çəkək,
Belə xırdalıqların üstündən qələm çəkək.
Kim bizə düşməndirsə, gözlərinə od tökək,
Xəlvət gəlmə görüşə, bəlkə hirsim soyuya.

**OVQAT**



## QƏLBİ HƏSRƏT YÜKLÜ ŞAİR

Doğrusu, illərdir Qasımuşağı obası və onun ətrafında keçmişdə və son dövrlər baş verənlər üzərində müxtəlif araşdırmalar aparıram. Bu səbəbdən də getdiyim hər yerdə (istər xeyir, istərtsə də şər mərasimlərində) bu məsələ ilə bağlı fikir və məlumatları yaşlı və gənc nəslin nümayəndələri ilə müzakirə etməyə çalışırdım.

Beş-altı il bundan əvvəl Bərdə rayonunda iştirak etdiyim yas mərasimindən geri dönürdüm. Dəmir yol vağzalına vaxtından xeyli əvvəl çatdım. Gözləmə zalında qatarın gəlməsini gözləmək üçün bir xeyli ləngiməli oldum. Təsadüf nəticəsində həmsöbət olduğum şəxslə tanışlıq zamanı onun əslən Laçınlı olduğunu bildim. Mənimlə sanki yüz illərin tanışı kimi davranan, çox mehriban, sadə xarakterə malik olan Məhiyyədin (Məhiyyədin Şahbazov) müəllimlə bir az da yaxından tanış oldum. O, Bərdə rayonunda anadan olmuş, burada böyüyüb boya-başa çatmışdı. Məhiyyədin müəllim Cumalar kəndində müəllim kimi çalışırdı. Onun əslən Laçın rayonunun İpək kəndindən olduğunu bilincə isə öz maraqlarımı gizlədə bilmədim. Ondan Kavanlı tayfası haqqında nələri bilib-bilmədiyini soruşdum. Sualıma bir az aydınlıq gətirən həmsöhbətim mənə söz verdi ki, sizi yaxın zaman kəsiyində axtardığınız məlumatlarla zəngin biliyə malik bir şəxslə – Bəxtiyar müəllimlə tanış edəcəyəm. Onu da qeyd etdi ki, “bunun üçün həmin şəxsin razılığını aldıqdan sonra ya birlikdə görüşüb söhbət edərik, ya da telefon nömrəsini sizə verərəm özünüz görüşüb dərdləşərsiniz”.

Bir müddət keçmiş mənə zəng edən Məhiyyədin müəllim Bəxtiyar Kavanlının ev telefon nömrəsini mənə söylədi. Elə ilk tanışlıqdan hiss etdim ki, Bəxtiyar müəllimin də bu mövzuya marağı böyükdür. İlk gördüyümdən bu insanın vətənpərvər, yurd həsrətli, şair təbiətli birisi olduğunu duydum.

Bəxtiyar Bəhmən oğlu Bəxtiyarov 15 sentyabr 1944-cü ildə Laçın rayonunun İpək kəndində kolxozçu ailəsində andan olub. 1951-ci ildə İpək kənd ibtidai məktəbinin 1-ci sinfinə gedib və 1955-ci ildə həmin məktəbin 4-cü sinfini bitirib.

1955-1957-ci illərdə Bülüldüz kənd natamam orta məktəbinin V-VII siniflərində oxuyub. VIII sinfi Ərdəşəvi kənd məktəbində oxuyan Bəxtiyar Bəxtiyarov IX-XI sinifləri isə Vağazin kəndində oxuyur və 1964-cü ildə həmin məktəbi müvəffəq qiymətlərlə bitirir.

1964-cü ilin payızında Sumqayıt şəhər Kimya Texnologiya Texnikumuna daxil olur və həmin ilin sonunda hərbi xidmətə yola düşür. Kiçik rütbələr alan Bəxtiyar Bəxtiyarov yaxşı xidmətinə görə "ehtiyatda olan zabitlər" kursunda təhsil almağa göndərilir. 1967-ci ildə ordudan tərxis olunur. Ordudan qayıdan və ehtiyatda olan baş leytenant Bəxtiyar Bəxtiyarovun ali təhsil almaq marağı onu təhsilini texnikumda davam etdirmək fikrindən daşındırır. Bu məqsədlə 1968-ci ilin yanvarından Bakı şəhərində tikinti idarələrindən birində fəhlə kimi əmək fəaliyyətinə başlayır. Nəhayət, 1970-ci ildə Bakı şəhərində V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutuna (indiki Azərbaycan Dövlət Pedaqoji Universiteti) müvəfəqiyyətlə imtahan verərək coğrafiya fakültəsinə daxil olur. Bir il əyani oxuyan Bəxtiyar doğma yurdda ona ehtiyac olduğunu duyduğu üçün təhsilini qiyabi davam etdirməyə məcbur olur. Beləliklə, 1971-ci ildə doğma rayona qayıdan Bəxtiyar Bəxtiyarov elə həmin ilin sentyabr ayından Ərdəşəvi kəndində pioner baş dəstə rəhbəri kimi pedaqoji fəaliyyətə başlayır. Öz peşəsinin vurğunu olan Bəxtiyar müəllim ixtisası üzrə əmək fəaliyyətinə davam edir və V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunu müvəffəqiyyətlə başa vurur.

1977-1978-ci tədris ilində Bülüldüz kənd natamam orta məktəbində çalışmağa başlayır. Yaxşı əmək fəaliyyəti göstərdiyi üçün Bəxtiyar müəllim bu təhsil müəssisəsində məktəb direktoru vəzifəsinə qədər yüksəlir və 1980-ci ilə qədər bu vəzifədə çalışır.

1980-1981-ci tədris ilindən Bülüldüz kənd natamam orta məktəbində təlim-tərbiyə işləri üzrə direktor müavini vəzifəsini icra etməyə başlayır.

1986-cı ildə Azərbaycan Xalq Maarifi Nazirliyi (indiki Azərbaycan Respublikası Təhsil Nazirliyi) tərəfindən Bəxtiyar Bəxtiyarova uğurlu pedaqoji fəaliyyətinə görə "Baş müəllim" adı verilmişdir.

1992-ci il mayın 18-də Laçın rayonu Ermənistan Respublikası Silahlı Qüvvələri tərəfindən işğal edildi. Yaşadığı yurdu tərk etməyi bacarmayan Bəxtiyar müəllim 3 gün kənddə tək yaşamalı oldu. Sonda qohumlar onun arxasınca gəlib xeyli çək-çevirdən sonra yola gətirdilər. Həmin vaxtdan etibarən Bakı şəhərinin Sabunçu rayonunun Sabunçu qəsəbəsində məcburi köçkün kimi məskunlaşdı. Bununla da Bəxtiyar müəllimin həyat yolunun əzablı, yurd-yuva həsrətli günləri başladı. Yurd-yuva itirənlərin ağır dərdlərə tuş

olduğunu yalnız bu dərdə düçar olanlar bilər – söyləməyim burada bəlkə də yerinə düşər.

Vətən həsrəti çəkən, didərginlik ömrünü yaşayan Bəxtiyar müəllim:

*Gözlərim yoldadı, bir marş oxuna,*
*Bir cəngi çalına, təbil vurula.*
*Səfərbər olunaq, müntəzir duraq,*
*Gedək Qarabağa, gedək döyüşə.*

*Sarılaq silaha bir nəfər kimi,*
*Düşməndən bac alaq ərən, ər kimi.*
*Şəhidlər qanını yerdə qoymayaq,*
*Gedək Qarabağa, gedək döyüşə...*

söyləyir.

Bu arzularını həyata keçirmək istəyi isə çox da asan deyildi. 1992-ci ilin may ayının sonundan iyun ayının əvvəllərinə qədər xeyli əmək sərf edərək bir qrup könüllü döyüşçü toplayan Bəxtiyar müəllim taqım komandiri təyin edilir. İyun ayının axırında 45 nəfər könüllü döyüşçü ilə birlikdə Laçının müdafiəsinə yollanır. Taqım komandiri kimi hərbi əməliyyatlara başlayan Bəxtiyar Kavanlının ilk döyüş yolu doğma ata yurdu Bülüldüzdən başladı. Bəxtiyar müəllimin dəstəsi Pircahandan kəsə yolla aşağı enib Bülüldüzə doğru irəliləyirdi. Dəstə kəndin yuxarı hissəsində özünə mövqe seçdi. Yuxarıdan baxanda kəndin hər tərəfi çox aydın görünürdü. Bəxtiyar müəllimə tanış olan bu əraziləri nəzərdən keçirən zaman kəndin aşağısında olan sahədə yad insanlar olduğunu sezdi. İlk öncə bütün əsgərlər bu barədə məlumatlandırıldı. Onların kimliyini müəyyənləşdirmək üçün bir az yaxın məsafəyə hərəkət etmək lazım gəldi.

Yaxınlıqda azərbaycanlı əsgərlər olduğunu hiss edən düşmənlər onları atəşə tutdular. Bax beləcə, Bəxtiyar müəllim düşmənlə ölüm-dirim savaşına atıldı. Onun söyləməsindən məlum olur ki, özündən asılı olmayaraq düşmən üzərinə yeriyən zaman sanki doğma ata-baba yurdu onu səsləyir, düşmən tapdağından azad olunmağa çağırırdı. Ölümü düşünmədən Vətəni azad etmək üçün saatlarla düşmənlə üz-üzə qələbə əzmi ilə döyüşən döyüşçülərimiz sonda öz arzularına çatdılar. Döyüşün sonunda 13 canlı qüvvə və xeyli hərbi sursat itkisi verən düşmən geri çəkildi, Bülüldüz kəndi düşmən tapdağından azad edildi.

Təəssüf ki, Kəlbəcərin işğalından sonra həmin əraziləri düşmən yenidən zəbt elədi.

Bakı şəhər 68 saylı orta məktəbin nəzdində təşkil olunmuş Laçın 3 saylı orta məktəbində bir müddət coğrafiya müəllimi işləyən Bəxtiyar Kavanlı 2011-ci ildən təqaüdə çıxıb.

1964-cü ildə “İlk dəfə səs verəcəyəm” adlı şeri ilə yaradıcılığa başlayan Bəxtiyar Kavanlının bu günə qədər dörd kitabı çap olunub: “Ömür vəfa etsə”, “Payız çiçəkləri”, “Dağlar bizi gözləyir” və “Dəryadan bir damla”.

Bəxtiyar Kavanlının Vətən həsrətli, yurd sevgili, qələbə ruhlu şeirlərini oxuyan hər bir kəs məftun olur. Şeirlərində daha çox klassikliyə üstünlük verən şairin dil üslubu sadə və çox rəvandır. Onun şeirlərinin mövzuları sadəcə ömür-gün sürdüyü həyatdan deyil, eləcə də ürəyinin yanğısından, qəlbinin göynərtisindən qaynaqlanmışdır.

Həmçinin Bəxtiyar Kavanlı 1984-cü ildən başlayaraq “Tarix, İctimaiyyət və Coğrafiya tədrisi”, “Azərbaycan təbiəti”, AMEA-nın Nizami adına İnsitutunda dərc olunan “Xalq və etnoqrafiya” jurnallarında, eləcə də “Azərbaycan müəllimi”, “Laçın” qəzetlərində müxtəlif elmi-pedaqoji yazılarla çıxış etmişdir. 2009-cu ili Bəxtiyar Kavanlı yaradıcılığının çiçəkləndiyi dövr hesab etmək olar.

Bəxtiyar Kavanlı ailəlidir. 2 oğul, 2 qız övladı böyüdüb boya-başa çatdırıb. 5 oğlan, 2 qız nəvəsi olan Qarabağ müharibəsi veteranı, şair Bəxtiyar baba “ömür” adlı atını torpaq həsrəti, yurd harayı, dağların hayqırtısı ilə yükləyib narahat dünyamızın keşməkeşli yollarında səyirtməklə özündə bir təsəlli tapır. Bəxtiyar müəllimə “gələcək planlarınız varmı?” – sualını verdikdə; “Sağlıq olsun, əgər yaşasaq yeni yazı-pozumuz olacaq” – söylədi. Biz isə kövrək, həsrət dolu, yurd niskilli qəlbi olan Bəxtiyar Kavanlıya gələcək həyatında Laçınlı günlər və yaradıcılıq yollarında uğurlar arzulayaq!



**Sultan HÜMBƏTOV**



**Vəliş ZİRVƏLİ**

## QARA GÜNLƏRİN ŞAHİDİ AĞ SAÇLI GİYA

Yaxşı yadımdadır, "Elimiz. Günümüz" qəzetində Qiymət Məhərrəmlinin Giya Paçxataşvili ilə müsahibəsini oxumuşdum. Giya o Giyadır ki, dünyanın min bir məhrumiyyətlərini görüb, min bir ağrısını yaşayıb. Qayğıdan, nəvazişdən, sevgidən, kökdən, bünövrədən uzaq Giya.

O müsahibəni oxuyandan sonra qəlbimdə Giya Paçxataşvilini görmək arzusu artdı. Məhəmməd Köçkünlə bir gün Giyanın qonağı olduq. Görüşdük qara günlərin şahidi ağ saçlı Giya ilə.

İlk görüşdən insana daha yaxın, daha doğma olan, həlim xasiyyətli, mehriban ünsiyyətli bir insanın söhbətlərindən doymaq olmurdu. Söz arası yeganə sirdaşı, həyat yoldaşı Lamara xanımın Tiflisdə ağır əməliyyatından danışdı. Biz də öz növbəmizdə Lamara xanıma Allahdan şəfa dilədik. Dünyanın bir çox əzab-əziyyətlərindən keçmiş bir insanın bu qədər saf, səmimi olduğuna inana bilmirdim.



Xeyli söhbət etdik. Söhbət əsnasında yaralı yerimiz olan Qarabağı qarış-qarış gəzdiyini, şair Ağa Laçınlı və yazıçı Aqil Abbasla Laçına getdiyini dedi. Saf qəlbli, doğma ünsiyyətli bu insanın söhbəti o qədər şirin oldu ki, vaxtın necə keçdiyini bilmədik.

Ayrıldıq. Sənə uzun ömür, cansağlığı, Lamara xanıma isə ulu Yaradandan şəfa diləyirik, əzizim Giya!

### ADAMI

*Giya Paçxataşviliyə*

Heç bilmədin ağ gün nədi,
Ey dünyanın ağ adamı.
Dərdə nə var girsə cana,
Əridər lap dağ adamı.

Hanı xoş günlərin, hanı?
Barmaqla sayılar sanı.
Dərd gəlsə qurudar canı,
Xəstə salar sağ adamı.

Qəmdən bağrın dəlik-dəlik,
Azalmır, artır üstəlik.
Hardan tapdı bu xəstəlik
Dərdinə ortaq adamı?

Dərd var qovsan iki əlli,
Gələr, işi olmaz bəlli.
Verən olsa bir təsəlli,
Saxlayar toxdaq adamı.

Dərd var artır gilə-gilə,
Həlli dönür bir müşkülə.
Dərd var gəlir gülə-gülə,
Gözləyir sınaq adamı.

Yaxşıları yamandan seç,
Hər sınaqdan üzüağ keç.
Əyilmədin, əyilmə heç,
Döz dövrün qoçaq adamı.



**P.S.** ***Yazı çapa gedərkən bir acı xəbər döydü qapımızı. Eşitdik ki, Giyanın ömür-gün yoldaşı, sirdaşı Lamara xanım dünyasını dəyişib. Allah rəhmət eləsin, qəbri nurla dolsun! Ulu Yaradan onsuz da səbirli olan Giyaya bir daha səbir versin!***

**Şərif AĞAYAR**



## ƏN BƏDBƏXT SÖZ ADAMI

Məncə, azəri türkcəsi öz ecazkarlığını heç bir şeir formasında bayatılar qədər uğurla nümayiş etdirə bilmir. Sələflərimizin ruhi vəziyyəti, onların kədərə meyilli mənəvi dünyası yeddi hecanın yaratdığı poetik aurada daha rahat ifadə olunur. Hətta qoşma və gəraylıdan da rahat!

Məmləkətimizdə 7-dən 70-ə elə adam tapmaq olmaz ki, bir neçə bayatı əzbər bilməsin. Qədimlərdən üzü bəri tanınan bircə azman bayatı ustası olub: Sarı Aşıq! Hətta Sarı Aşıq o qədər bayatının mahiyyətinə hopub ki, ondan neçə əsr sonra bayatı yazan və ya deyən müəlliflər də öz yaratdığı nümunələrə "Mən Aşıq..., Mən Aşığam...," ifadələri ilə başlayıblar. Bu ifadə şeirin müəllifini nişan verməkdən ziyadə bayatının vacib komponentlərindən birinə, onun formasını şərtləndirən vacib amilə çevrilib.

Mütəxəssislər zaman etibarı ilə Sarı Aşıqdan əvvəl yaranmış bayatıların adətən "Əzizinəm" ("Əziziyəm") ifadəsi ilə başladığını söyləyirlər. Bəziləri isə hesab edir ki, bu ifadə Əzizi adlı bayatı ustasının ədəbiyyatımızda qoyduğu irsin göstəricisidir. Ancaq bu elmi ehtimal lazımi səviyyədə öz təsdiqini tapmayıb. Sarı Aşıq isə, bildiyiniz kimi, tarixi şəxsiyyətdir və qəbir yeri məlumdur. Onun həyatı və fəaliyyəti daha çox rəvayətlərdə anladılsa da!

Azərbaycan ədəbiyyatında bəlkə də Sarı Aşıq qədər talesiz söz adamı olmayıb. İstedadı başına bəla olan bu böyük sənətkar sağlığında çəkdiyi məşəqqətlər bir yana, ölümündən neçə əsr sonra da sanki unudulmağa məhkumdur. Müəllifi olduğu bayatılar onun-bunun adına çıxılır, sözlərinə oxunan mahnılarda quruca adı belə çəkilmir. Ən dəhşətlisi, bu vəziyyət heç kimi narahat etmir! Onun böyük sənətkar olduğunu bilən vicdanlı qələm sahiblərini belə!

Hər kəsdən müjdəmi istərəm: artıq bu problem aradan qalxdı!

Dostumuz, istedadlı şair İlham Qəhrəman Sarı Aşığın şeir və bayatılarını, onunla bağlı əhvalatları, tarixi mənbələri, fotoları bir yerə toplayan maraqlı bir kitab ərsəyə gətirdi. Adı da "Gül dəftəri". Kitab müəllifin ön sözü ilə açılır və bayaqdan bəhs etdiyim, etmədiyim bir çox məsələlərə aydınlıq gətirilir.

Diqqətli oxucular bilirlər ki, İlham Qəhrəman bundan əvvəl "Laçın folkloru" adlı çox dəyərli bir kitab nəşr etdirmişdi. Dağılmış yurd-yuvamızı, el-obamızı kitabdasa da birləşdirmək ehtiyacından doğan "Laçın folkloru" həm də böyük zəhmətin, ölçüyəgəlməz çətinliklərin hesabına başa gəlmişdi. Axı laçınlılar indi hərəsi bir diyarda yaşayır. Üstəlik, o torpaqla bağlı şifahi nələrsə bilən insanların çoxu artıq ya dünyasını dəyişib, ya da çox yaşlanıblar. Buna mən şahidəm ki, İlham bəy hansı bölgədə sinədəftər bir laçınlı ağbirçəyin, ağsaqqalın yaşadığını eşidibsə, ərinmədən oraya yola düşüb, canı qədər sevdiyi doğma torpaqlar haqqında mümkün qədər daha çox və daha dəyərli mətnlər toplamağa çalışıb. Özü də ilin-günün bu vaxtında, hər kəsin bir loxma çörək dalınca düşdüyü bir zamanda. Və yəqin ki, bu kitablardan heç müəllifin yol xərcinin çıxmadığını eşitsəniz, siz də mənim kimi təəccüb edərsiniz. Bunun bircə adı var: fədakarlıq! Birinci fədakarlığın eyforiyası dağılmamış daha bir sürpriz Sarı Aşıqla bağlı gəldi. Kitab barədə heç nə yazmaq istəmirəm. Çünki heç bir yazı kitabı əvəz edə bilməz. Mən sadəcə, bu kitabı əldə edib oxumağı məsləhət görürəm.

İnanıram ki, "Gül dəftəri" hər kəsin stolüstü kitabına çevriləcək. Burada toplanmış bayatıları gündə on dəfə də oxusan, eyni ləzzəti alacaq, dilimizin hüdudsuz imkanlarına heyrət edəcəksən. Məncə, "Gül dəftəri" Sarı Aşığa qarşı zaman-zaman bəslənən tarixi ədalətsizliyi aradan qaldırmaqla bahəm, həm də qələm adamları üçün əvəzsiz bir töhfədir. Etiraf edək, son zamanlar tanınmış söz adamları arasında ən az oxuduğumuz özümüzünkülərdir. Bu isə hamımızın yaradıcılığındakı dil və üslub məsələlərinə öz təsirini göstərir.

**KİTAB RƏFİ**

## "AYRI ADAM"




1961-ci ildə qədim Həməşərənin (indiki Cəlilabad) Sadatlı yurdunda təvəllüd tapan Zakir Sadatlı ixtisasca filoloqdur. 1983-cü ildən ədəbi-bədii yazıları ilə respublika mətbuatında çıxış edib. Əsərləri rus, türk, ərəb, alman və tatar dillərinə tərcümə olunaraq, dünyanın bir çox ölkəsində nəşr edilib.

2008-ci ildə böyük tədqiqatçı M.Kaşğarinin 1000 illik yubileyi çərçivəsində YUNESKO-nun 24 türkdilli ölkə yazıçıları arasında keçirdiyi hekayə müsabiqəsində Azərbaycan üzrə 1-ci, Türk dünyası üzrə isə 3-cü yeri tutdu.

Əfqanıstan və Qarabağ müharibəsi veteranı olan Zakir Sadatlı Azərbaycan Yazıçılar Birliyinin və Avrasiya Yazıçılar Birliyinin üzvü idi. Respublika mətbuatında yüzlərlə şeir və publisistik yazıları çap olunub.

"Əfqanıstan uçurumu" (xatirə-roman), "İraq olsun" (sənədli povest), "Salam, baça" (hekayə) və başqa dəyərli əsərləri ilə tanınır. Onu da xatırladım ki, gənclik illərinin töhfəsi olan əlyazmalar Zakir Dağlı imzası ilə işıq üzü görüb.

"Qırmzı Ulduz", "İgidliyə görə", "Döyüş xidmətlərinə görə" medalı ilə təltif olunanda Zakirin 19-20 yaşı vardı. Əfqanıstan döyüşlərində qorxmazlığı, cəsarəti, ötkəmliyi və mərdliyi ilə qazanmışdı bu adı. Ən çətin sınaqlarda sanki özünü imtahana çəkmiş, silahdaşlarına örnək olmuşdu.

Tanınmış jurnalist Xanlar Bayramovla birgə müəlliflik etdiyi "Onu Gəncə böyütmüşdü" kitabı görkəmli ziyalı Tofiq Bağırovun yaradıcılığına həsr olunub. "Yaşıl budaqlar" adı altında ərsəyə gələn almanaxda Z.Sadatlının sanbalı və dəyəri ilə seçilən əsərləri yer alıb.

O, həm də Azərbaycan Cümhuriyyəti fədailərindən biri olan, ömür boyu mühacirətdə yaşamış Əziz Alpoudun "Həyatımın hekayətləri" adlı tarixi memuarını Türkiyə türkcəsindən Azərbaycan türkcəsinə çevirərək çap etdirib. Bu tarixi əsər respublikamızda və Türkiyədə böyük əks-səda doğurduğuna görə, türk soydaşlarımız həmin kitabı Türkiyə türkcəsinə çevirərək, yenidən nəşr etdirdilər.

Zakir Sadatlı uzun müddət Azərbaycan Televiziya və Radio Verilişləri QSC-də böyük redaktor, sonra isə Azərbaycan radiosunun "Gənclik və idman" redaksiyasında baş redaktor müavini vəzifəsində işləyib. 20-dən artıq sənədli filmin və yüzlərlə radio verilişinin ssenari müəllifi olub. "Gündoğandan günbatana" telelayihəsi Sadatlı yaradıcılığının özünəməxsusluğunu, dünyagörüşünü, peşəkarlığını diktə etməklə yanaşı, Şərqlə Qərb arasındakı tarixi bağlılıqdan doğan bu əsərin unikallığı müəllifin həyat səhnəsinə verilən qiymətdir. Son vaxtlar "Ayrı söhbət" adlı telelayihə üzərində işləyirdi. Heyif ki, bu arzusu özüylə birgə torpağa gömüldü.

Sadatlı həm də müqəddəs Kərbəla şəhərini – İmam Hüseyn məqbərəsini ziyarət etmiş, Kərbəlayı adını almışdır. Maraqlıdır ki, ziyarətdən geri dönən Zakir əbədiyyət dünyasının rəmzi olan ağ libas gətirmişdi özüylə. Deyirdi ki, o libasa "Haqq Evi"nin qoxusu hopub. Axırda da özünə qismət oldu.

Çox təəssüf ki, yaradıcılığının çiçəklənən bir vaxtında – 52 yaşında, 2013-cü ilin 5 fevral günündə, bütün dostlarını cismən tərk etdi və bu fani dünya ilə vidalaşdı Zakir Sadatlı. Ruhun şad olsun, qardaş!

ÖTƏRXAN ELTACın min bir əziyyətlə ərsəyə gətirdiyi "AYRI ADAM" xatirə kitabı inanırıq ki, oxucular tərəfindən maraqla qarşılanacaq.

POEZİYA

**Arif PƏNAHOĞLU**



## LAÇINIM

Yağı həmləsiylə, şeytan feliylə,
Dağılıb sökülən, talan Laçınım.
Can qurban deyirik,verə bilmirik,
Hicrandan gözləri dolan Laçınım.

Allahım, xəyallar gör uçur hara,
Könül hey can atır güllü gülzara.
Ötən xatirələr qəlbimdə yara,
Olmusan əfsanə, yalan, Laçınım.

Niyə belə yazdı taleni yazan,
Alıbdı üstünü qara çən, duman.
Yağı tapdağında baharı xəzan,
Zillətdən saralıb-solan Laçınım.

Dönüb sükunətə qaynar həyatı,
Didərgin düşübdü eli, elatı.
Dağlarda çalınmır "Çoban bayatı",
Tənha, qəm tütəyi çalan Laçınım.

Sən bizə bəxş etdin vüqar, əzəmət,
Qürur, mərdanəlik, dözüm, cəsarət.
İndi sən bizlərdən umursan qeyrət,
Kimsəsiz, biçarə qalan Laçınım.

Aslantək oğullar qolları bağlı,
Sənə qovuşmağa sinəsi dağlı.
Az qalır adamın yox ola ağlı,
Ağlımı, huşumu alan Laçınım.

Arifəm, sən mənim yurdum, ünvanım,
Həm ana vətənim, dədə məkanım.
Sənin həsrətindən əriyir canım,
Dərdindən dərd tapdı balan, Laçınım.
Ağlımı, huşumu alan Laçınım.

## SƏRRAF ŞİRUYƏYƏ

Əlçatmaz zirvədi əzəmətiylə,
Qalalar yaradıb söz sənətiylə.
Peyğəmbərsayağı mərhəmətiylə
Əhli-hal insandı Sərraf Şiruyə.

Tanrıya bağlayır ruhu adamı,
Könüldə gəzdirir tanıyan hamı.
Dağlar çeşməsidi təbi, ilhamı,
Sahilsiz ümmandı Sərraf Şiruyə.

Vurğundu vətənə, vurğundu elə,
Gəzir kəlmələri dillərdən dilə.
Sözləri məlhəmdi xəstə könülə,
Təbibdi, loğmandı Sərraf Şiruyə.

Sönübdü Göyçədə alışan şamı,
Olub yurd dərdlisi, hicran adamı.
Deyir tərpətməyin hovlu yaramı,
Sızlayan kamandı Sərraf Şiruyə.

***16 mart 2014-cü il,***
***Donetsk şəhəri***

## GÖYÇƏ DEMƏ...

***Laçın həsrətiylə yaşayıb-yaradan, mənə və mənim poeziyama böyük dəyər verən, hal-hazırda Donetsk şəhərində məskunlaşan hörmətli Arif Mikayılova***

Hoçazın başına dolandığıtək,
Başına dolanar Sərraf Şiruyə.
Vətən həsrətiylə yanar közünə,
Odlanıb qalanar Sərraf Şiruyə.

Olar dərdiməndin, könlünü yapar,
Hər adi kəlməndən təsəlli tapar.
Şəlvə çayı kimi haray qoparar,
Durular, bulanar Sərraf Şiruyə.

Yaman çatıb Budaqdərə qaşını,
Minkənd tökür gözlərinin yaşını.
Laçının, Göyçənin torpaq, daşını
Bal bilib yalanar Sərraf Şiruyə.

Hikmət boxçan oldu mənə ləl kimi,
Tutdu əllərimdən doğma əl kimi.
Yüz yerə dağılan köçkün el kimi
Talanıb, talanar Sərraf Şiruyə.

Arif, qəlbim olub parça-paratək,
Həsrət yandıracaq məni goratək.
Göyçə demə, qövr eləyən yaratək,
Göz verib sulanar Sərraf Şiruyə.

***27 mart 2014-cü il,***
***Bərdə, Yeni Daşkənd***

## LAÇIN MƏNDƏ YAŞAYIR

Əlacına çarəsi yox, çarəsinə dərmanı,
Yazıqlardan yazıq ürək nə qədər dərd daşıyır.
Ruhum hopub dağlarının qayasına, daşına,
Mən Laçında yaşamıram, Laçın məndə yaşayır.

Bulaqları göz yaşımdı, axıb süzür qəlbimə,
Dağlarının çəni bənzər başdan qalxan tüstümə.
Yağı düşmən dərd halında qoşun çəkir üstümə,
Qaysaq tutmaz yaraları didib, oyub, qaşıyır,
Mən Laçında yaşamıram, Laçın məndə yaşayır.

Neçə-neçə şəhidlərin məzarı var sinəmdə,
Köçkün bir el məskunlaşıb, pənah tapıbdı məndə.
Əzab sökür varlığımı, zillət çəkirəm gündə,
Zalım fələk işgəncəsin sağdan-soldan döşəyir,
Mən Laçında yaşamıram, Laçın məndə yaşayır.

Görən nə vaxt dinclik tapıb, yorğun ruhum dincələr,
Ölümdən qorxmayan Arif, Allah, çəkir gör nələr?!
Qorxuram ki, vay ...ölərəm, içimdə Laçın ölər.
Könlüm belə bir əcəlin sazağından üşüyür,
Mən Laçında yaşamıram, Laçın məndə yaşayır.

**KİTAB RƏFİ**

## "QÜRBƏTƏ SIĞMAYAN VƏTƏN HƏSRƏTİ"




Dünyada dərd çoxdur. Dərdin çeşidləri də çoxdur. Fiziki şikəstlik, sağalmaz xəstəliklər dərddi. Əyri ilə düz tərəzinin gözündə bərabərdisə dərddi. Birinin ürəyində nakam bir məhəbbətin ağrıları düyünlənib, bu da dərddi. Dərdlər, dərdlər, dərdlər. Ən böyük dərd Vətən dərddidi. Dərdin ağrılılığını dərd çəkənlər bilər. Dərd çəkənlər anlayanlardı, əriyə-əriyə yananlardı. Bu dərdi Cəmşid Dərələyəzli çəkir. Vətən deyib, Dərələyəz deyib əriyə-əriyə yanır. Qürbətə sığmayan vətən həsrəti deyən dostum, əmim Cəmşid Dərələyəzli. Cəmşid Dərələyəzli bu gün Azərbaycanda tanınmış ziyalıdı. Mənəviyyatlı şəxsiyyətdir. Vətənpərvər vətəndaşdı. İki dəfə 2000, 2005-ci illərdə Azərbaycan Respublikasi Milli Məclisinə seçkilərdə namizədliyi qeydə alınmış, deputatlığa namizəd olmuşdur. İqtisadiyyat üzrə 16 elmi məqalənin müəllifidir. Doğma Ələyəz kənd ağsaqqallarının 18 mart 2012-ci il tarixli qərarı ilə Kənd Ağsaqqallar Şurasının sədri seçilmişdir. Qərbi Azərbaycanla bağlı filmə çəkilib. Vətən haqqında, Dərələyəz haqqında gördüklərini, bildiklərini, eşitdiklərini qələmə alıb. Sanballı bir kitab yazıb. "Qürbətə sığmayan vətən həsrəti" kitabını. Müəllif bu kitabı Azərbaycanın qədim və əzəli torpaqlarının bir parçası olan Dərələyəz mahalının Ələyəz kəndində dünyaya göz açmış və o torpaqlarda da dünyadan köç etmiş əcdadlarımızın və son deportasiyadan sonra yurd həsrəti ilə gözlərini əbədiyyətə qapamış nəsillərin nisgilli xatirəsinə ithaf edib. Cəmşid müəllim "Qürbətə sığmayan vətən həsrəti" kitabında doğma yurdu Ələyəz kəndinin təbiəti, ərazisi, coğrafi mövqeyi, XX əsrin sonlarında baş vermiş hadisələr, erməni faşistlərinin soydaşlarımızın başına gətirdikləri faciələr və itkilər barədə ürək yanğısı ilə söz açıb. Kəndin sosial həyatı, sakinlərin məişəti və məşğuliyyəti, mənəvi dəyərləri, adət-ənənələri, yurdun təbii sərvətləri və bənzərsiz təbiətini sadə el dilində qələmə alıb. Kitabda Ələyəz kəndinin foto-görüntülərinə, Arpaçayının şəkillərinə baxdıqca ötüb keçən xatirələr yada düşür. Ələyəz kəndinin əhalisi Azərbaycanın müxtəlif rayonlarında yaşayırlar. Bu kəndin ziyalıları Azərbaycana xidmət edirlər. Məlahətli səs sahibi, mənim yaxın dostum Baba Dərələyəzli də bu kəndin sakinidi. Cəmşid müəllim kitabının son sözündə belə bir məqama toxunur: – Yazdım ki, kəndimizin izi itməsin. Xatirələr köhnəlməsin. Qoy həmişə təzə qalsın. Gələcək nəsillərə bir xatirə və bir də xəritə olsun ki, daima o yerləri qaytarmaq və o yerlərə qayıtmaq arzusu ilə çırpınsın ürəkləri. Cəmşid müəl-

lim, kitabınla baş-başa qaldım. "Qürbətə sığmayan vətən həsrəti" kitabın Dərələyəzin açarıdı. İndiyə qədər vətən, el-oba, yurd haqqında çoxlu kitablar yazılıb. Yazılan kitablar bu kitab qədər təsiredici olmayıb. Bu kitabdan tarixçilər, coğrafiyaçılar, folklorçular bəhrələnə bilərlər. Bu kitab ali məktəbdə dərslik kimi istifadə edilə bilər. Bu kitabda dərd, həsrət, yurd sevgisi, vətən eşqi var. Havana, suyuna qurban olum, ay Dərələyəz. Görən dünyada tayı-bərabəri varmı Dərələyəzin? Torpağa, yurda tapınmaq mənəvi saflıqdı. Torpağa əyilmək bütövləşməkdi. Şahmalı Kürdoğlu heyratısı – vətəndi. Zil İdrisin səsi vətəndi. Tofiq Yusif yanğısı vətəndi. Aşıq Əli Bəxşəliyevin sazı vətəndi. Zakir Şəhriyaz, Talıb Məmmədli poeziyasi vətəndi. Cəmşid Dərələyəzli naləsi vətəndi. Yurdda doğulan yurdda ölürsə, vətən var. Kökümüz o torpaqdadı. Qayıtmalıyıq ki, kimliyimizi azğın düşmən tanısın. Hər kəsə öz kəfəni boyda torpaq qalıb. Kəfən əmanəti.



**Elnur BAXIŞ**

**<u>ARAŞDIRMA</u>**

## II DÜNYA MÜHARİBƏSİNDƏ HƏLAK OLAN LAÇINLILAR…

**Mustafayev Sevdimalı** 1901-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 328-ci atıcı diviziyanın tuşlayıcısı 4 may 1943-cü ildə döyüşdə həlak olmuşdur. Rusiya Federasiyasının Krasnodar diyarının Nebercayevka stansiyasında dəfn edilmişdir.

**Mustafayev Yunis** 1919-cu ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 169-cu atıcı diviziyanın 556-cı atıcı alayının avtomatçısı 20 may 1942-ci ildə həlak olmuşdur. Ukrayna Respublikasının Xarkov vilayətinin Vesyoloye kəndində dəfn edilmişdir.

**Mustafayev Məmməd** 1907-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 33-cü ordunun 164-cü atıcı diviziyasının 459-cu atıcı alayının avtomatçısı 24 mart 1944-cü ildə həlak olmuşdur. Belarusiya Respublikasının Vitebsk vilayətinin Liozno rayonunun Teşki kəndində dəfn edilmişdir.

**Mustafayev Əbdürrəhman Abdulla oğlu** 1900-cü ildə Laçın rayonunda doğulmuşdur. 1941-ci ildə Laçın RHK-ğı tərəfindən orduya çağırılmış-

dır. Sıravi əsgər, 814-cü atıcı alayın avtomatçısı 24 yanvar 1943-cü ildə həlak olmuşdur. Rusiya Federasiyasının Krasnodar diyarında dəfn edilmişdir.

**Mustafayev Hafiz Novruz oğlu** 1923-cü ildə Laçın rayonunda doğulmuşdur. 1941-ci ildə Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 186-cı zenit atıcı alayının avtomatçısı 10 yanvar 1944-cü ildə həlak olmuşdur. Belarusiya Respublikasının Vitebsk vilayətinin Vitebsk rayonunda dəfn edilmişdir.

**Mustafayev Mərdan Qafan oğlu** 1901-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 370-ci atıcı alayının avtomatçısı 26 may 1942-ci ildə həlak olmuşdur.

**Muradov Bahadur Cəbrayıl oğlu** 1898-ci ildə Laçın rayonunda doğulmuşdur. 1941-ci ildə Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 328-ci atıcı diviziyanın avtomatçısı 10 may 1943-cü ildə həlak olmuşdur.

**Nuriyev Asəf Paşa oğlu** 1912-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər 9 mart 1943-cü ildə aldığı yaradan vəfat etmişdir.

**Nuriyev Asif Tağı oğlu** 1895-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 217-ci atıcı alayın avtomatçısı 9 mart 1943-cü ildə həlak olmuşdur. Rusiya Federasiyasının Krasnodar diyarında dəfn edilmişdir.

**Nəsibov Fərman** 1912-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Sıravi əsgər, 62-ci atıcı diviziyanın 123-cü atıcı alayının avtomatçısı 3 dekabr 1941-ci ildə həlak olmuşdur. Rusiya Federasiyasının Kursk vilayətinin Manturovo rayonunda dəfn edilmişdir.

**Nəsirov Tapdıq Nəsir oğlu** 1914-cü ildə Laçın rayonunda doğulmuşdur. 1941-ci ildə Laçın RHK-ğı tərəfindən orduya çağırılmışdır. Baş serjant, 19-cu atıcı diviziyanın 32-ci atıcı alayının manqa komandiri 23 noyabr 1944-cü ildə həlak olmuşdur. Macarıstan Respublikasında dəfn edilmişdir.

**Nəsirov Firudin** Laçın rayonunda doğulmuşdur. Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1 iyun 1944-cü ildə həlak olmuşdur. Rusiya Federasiyasının Krasnodar diyarının Soçi şəhərində dəfn edilmişdir.

**Nəsirov P...** 1908-ci ildə Laçın rayonunda doğulmuşdur. Laçın RHK-dan orduya çağırılmışdır. Sıravi əsgər 1 iyun 1944-cü ildə həlak olmuşdur. Rusiya Federasiyasının Krasnodar diyarının Soçi şəhərində dəfn edilmişdir.

**Mənbə:**

• Azərbaycan Respublikası Xatirə Kitabı, XI cild, M, N hərfi, Bakı, 2011

*Hazırladı:* **Araz YAQUBOĞLU**

**POEZİYA**



**Mübariz SÜLEYMANLI**

## LAÇINDA

Tərlanlar qıy vurub süzər səmada,
Ərənlər yurdunda – elim Laçında.
Bir yaz çiçəyitək düşəcək yada,
Necə xoş keçirdi ilim Laçında.

Olmasın heç zaman mənə göz dağı,
Bozdağı səsləyər Mıxtökən dağı.
Quşçu, Mirik, Bozlu vətən torpağı,
Göylərə açılsın əlim Laçında.

Sevincim azalır, kədər çoxalır,
Könlümü odlayan didər çoxalır.
Gələnlər azalır, gedər çoxalır,
Həsrətdən solubdur gülüm Laçında.

Qurdqajı yetirib ər Sultan bəyi,
Nağdalı, Güləbird gözüm bəbəyi.
Mən necə qarğıyım zalım fələyi,
Közərib, soyuyur külüm Laçında.

Gələrəm görməyə Susu, Minkəndi,
Qaragöl həsrəti qəlbi didəndi.
Sonasar, Kamallı candır, bədəndir,
"Ay ana", deyəydi dilim Laçında.

Vətənsiz həsrətə dözməz bir qul da,
Əyilər qamət də, qırılar qol da.
Mübarizin gözü qalmasın yolda,
Kədəri qəlbimdən silim Laçında.

**KİTAB RƏFİ**

## "RUHU GİLEYLİ ANAM" – QARABAĞ HƏSRƏTLİ YAZILAR



Mənim şair-publisist Rövşən Atakişioğlu ilə tanışlığımın tarixi cəmi bir neçə ildir. Onu mənimlə ilk dəfə tanış edən dostum – "Bilik" hazırlıq mərkəzinin rəhbəri, pedaqogika üzrə fəlsəfə doktoru Cəbrayıl Qəhrəmanov olub. Cəbrayıl müəllimin ilk təqdimatı isə, təxminən, belə olub: Tanış ol, Rövşən müəllimdir, gözəl şairdir, dostum, qohumum və həmyerlimdir. Cəbrayıl müəllimin ədəbi zövqünə yaxşı bələd olduğumdan, bu təqdimatın nə demək olduğunu çox yaxşı başa düşdüm. Çünki bu təqdimatda "Gözəl şair" epitetinin "Dostum", "Qohumum" və "Həmyerlim" sözlərindən əvvəldə deyilməsi mənə çox mətləblərdən xəbər verirdi. Özü yaradıcı bir insan olan, şeiri, şeiriyyatı, ümumiyyətlə, ədəbiyyatı gözəl bilən bir söz adamının çox incə bir ədəbi priyomla Rövşən müəllimi belə təqdim etməsi mənim üçün anlaşılan oldu. Hiss etdim ki, Rövşən Atakişioğlu çağdaş ədəbiyyatımızda Cəbrayıl müəllimin qəbul etdiyi və yüksək qiymətləndirdiyi gözəl şairlərdən biridir.

Sonralar mən Cəbrayıl Qəhrəmanovun Rövşən müəllimin "Yolum dağlara sarıdı" kitabına yazdığı ön sözünü və müəllifin şeirlərini oxuyanda bir daha əmin oldum ki, hisslərimdə yanılmamışam. Oxuduğum şeirlər gözəl şeirlər idi. Yeni söz, təzə fikir, poetik ifadələrlə zəngin olan bu şeirlər onun müəllifi haqqında məndə Cəbrayıl müəllim demişkən "Gözəl şair" obrazını yaratdı. Mən Rövşən Atakişioğlunu yaxın günlərə kimi gözəl şair kimi tanıdım və onun yazıçılıq, publisistik fəaliyyətindən xəbərim olmadı.

Bu yaxınlarda Cəbrayıl müəllim mənə Rövşən Atakişioğlunun yeni bir kitabının işıq üzü gördüyünü dedi. Elə iş yerində kitabı alıb vərəqlədim. Kitab "Ruhu gileyli anam" adlanırdı. Kitabın adı, fikrimcə, uğurlu seçilmişdi. Gökəmli alman şairi və dramaturqu Fridrix Şiller yazırdı ki, kitaba və ya bədii əsərə yaxşı ad seçmək onun qazanacağı uğurunun, təxminən, yarısı deməkdir. Kitabı Cəbrayıl müəllimdən alıb elə həmin gün oxuyub başa vurdum. Kitaba müəllifin "Yuxu" nağıl-hekayəsi, epistolyar janrda yazdığı "Yurduma məktublar" publisistik yazısı, "Boyeviklərin aşnalığı" adlı satirik hekayəsi, "Xocalı soyqırımı şahidlərin dili ilə" publisistik yazıları, eləcə də "Sözlük", "Qınamalar", "Bölgəmizdə işlənən bəzi frazemlər", "Sahibsiz

qalmış yurd-buralar Laçındır" və "Tərcümeyi-halım" kimi elmi-publisistik yazıları daxil edilmişdir.




Kitabdan ilk oxuduğum əsər müəllifin "Yuxu" nağıl-hekayəsi oldu. Əsəri oxuyub qurtarandan sonra məndə əsər haqqında yaranan ilkin təəssürat belə oldu: yalnız milli təəssübkeşliyi böyük olan, Vətənini, onun insanlarını ürəkdən sevən, xalqının tarixi keçmişinə, gələcəyinə biganə olmayan bir yaradıcı insan bu cür əsər yaza bilər. Əsərdən çıxan ideya, qayə isə əsəri oxuyan hər bir oxucuya gün kimi aydın olurdu: "Xalqını, millətini, onun gələcəyini azad, xoşbəxt və firavan görmək." Bu isə bədii əsərdə onun formasından, məsələnin necə qoyulub həll edilməsindən (bu, başqa bir söhbətin mövzusudur) asılı olmayaraq çox mühüm amildir. Əsər müəllifin arzularına, istəyinə görə ədalətin zəfəri, təntənəsi ilə başa çatır. Bununla da müəllif "Pisin hakimiyyəti rəzalət, yaxşının hakimiyyəti ədalət gətirər" fikrini əsərin əsas qayəsi kimi əsaslandırmağa çalışır.

Kitabda verilən "Yurduma məktublar" bölməsi epistolyar janrda yazılıb. Bunu müəllifin uğurlu bədii tapıntısı kimi də qəbul etmək olar. Ədəbi aləmdə hansı mövqedə dayanmasından, hansı yazı tərzinə, hansı ədəbi növə, janra üstünlük verməsindən asılı olmayaraq hər bir bədii düşüncə sahibinin sevimli mövzuları, Vətənə, yurda, təbiət və cəmiyyət hadsələrinə və digər mövzulara özünəməxsus yanaşma tərzi olur. Bu meyarla Rövşən Atakişioğlunun yaradıcılığına yanaşılarsa, onun ən çox sevdiyi mövzulardan biri VƏTƏN mövzusudur. Aydındır ki, Azərbaycan ədəbiyyatında Vətən, yurd mövzusunda yazılmış əsərlərin təkrarsız nümunələri çoxdur. Azərbaycan ədəbiyyatında Vətənlə, yurdla bağlı yazılmış əsərlərin ümumi mənzərəsinə diqqət yetirsək, görərik ki, burada bütöv halda Azərbaycanın bənzərsiz gözəlliklərindən, yurdumuzun igid, qəhrəman övladlarından, tariximizin şərəfli səhifələrindən və s. mövzulardan poetik bir dillə bəhs olunur. Lakin R.Atakişioğlunun Vətənə, doğma yurda həsr olunmuş əsərlərini başqalarından fərqləndirən mühüm cəhətlər çoxdur. Bunlardan biri onun bu mövzulu yazılarında Vətən həsrətinin, Laçın, Qarabağ həsrətinin ana xətt kimi keçməsidirsə, digəri yaşadığımız dövrün və zamanın acı reallıqlarının – erməni işğalı altında olan Vətən torpaqlarının ağrı-acısının, dərd-sərinin, nisgilli ruhunun realist bir dillə əks etdirilməsidir.

Bu mövzulu yazılarda doğma Azərbaycanın hər guşəsini: onun Şuşasını, Laçınını, Xocalısını, Bakısını, Şirvanını... sevən, vətənpərvər bir insan qəlbinin acı çırpıntıları, eyni zamanda ulu yurdunun erməni işğalından irəli gələn nisgilli yaşantıları qabarıq şəkildə duyulur. R. Atakişioğlunun belə yurd həsrətli, yurd nisgilli yazılarını – "Qəbrinə darıxdığım Aşıq", "Qonşu haqqı – Tanrı haqqı", "Ruhu gileyli anam", "Nankorlar" kimi yazılarını həyacansız oxumaq olmur. Onun bu qəbil yazıları vətənə, el-obaya, vətənin hələ də yağı düşmən tapdağı altında qalan torpaqlarına qırılmaz tellərlə bağlılığını hiss etmək, duymaq baxımından çox əhəmiyyətlidir.

...Dünyada çox az xalqlar tapılar ki, o, bu və ya digər dərəcədə erməni hiyləsindən, erməni şovinizmindən və nəhayət, erməni terrorundan əziyyət çəkməsin. Bu mənfur millətin məkrindən və fitnəsindən ən çox qəddarlıq, əzab və zülm görən xalqlardan biri və bəlkə də birincisi Azərbaycan xalqı olmuşdur. Tale elə gətirib ki, biz özünü həmişə "əzabkeş", "yazıq", "cəfakeş" kimi qələmə verən, əslində isə "vəhşilik", "nadanlıq" və "qəddarlıq" rəmzinə çevrilmiş bir xalqla qonşu olmaq məcburiyyətində qalmışıq. Qonşu dövlətlərə, o cümlədən Azərbaycana qarşı əsassız ərazi iddiaları irəli sürən, dənizdən-dənizə "Böyük Ermənistan" dövləti yaratmaq kimi sərsəm ideyaya və şovinistlik, qatı millətçilik kimi qeyri-insani keyfiyyətlərə malik olan xəstə təxəyüllü bədnam erməni daşnakları əsrlər boyu azəri türklərinə qarşı olmazın böhtan və iftiralarla çıxış etmişlər. Qara dənizdən Xəzər dənizinə kimi dövlət yaratmaq niyyətində olan ermənilər mütəmadi olaraq Cənubi Qafqazın qədim, aborigen xalqı olan azərbaycanlılara qarşı soyqırım, işğalçılıq siyasəti aparmış və nə yazıqlar ki, buna nail olmuş, torpaqlarımızın 20 faizə qədərini işğal edə bilmişlər. Lakin bu işğalı onların gücü ilə deyil, "böyük qardaşı"olan rusların, onların bədnam 366-cı alayının köməyi ilə əldə edə bilmişlər.

Rövşən Atakişioğlunun "Boyeviklərin aşnalığı" hekayəsində adı keçən məsələlərə bu və ya digər şəkildə toxunulur, ermənilərin Xocalıda törətdikləri qəddarlıq və vəhşiliklər xüsusi ştrixlərlə, spesifik çizgilərlə əks etdirilir. Əsərdə doğma Xocalının "Əsrin faciəsi" sayılacaq ağrı-acısı, əzab və sızıltıları, eləcə də onun hər bir vətənpərvər azərbaycanlıya tanış olan qanlı faciələri Rövşən Atakişioğlu tərəfindən yaddaqalan şəkildə, ürək sızladan epizodlarla əks etdirilir.

"Boyeviklərin aşnalığı" hekayəsində müəllifin obrazlı təfəkkürünün məhsulu olan Aşot, Samvel, Şiranuş, Aşotun atası Seroj kişi kimi cılız, əyyaş, miskin və qəddar, mənəvi cəhətdən puç olan bu obrazlar nitq vahidlərinin potensial imkanlarına söykənmək, eləcə də bədii təsvir və ifadə vasi-

tələrinin istifadəsi baxımından yüksək sənətkarlıqla yaradılmışdır. Bu hekayə R.Atakişioğlunun nəsr sahəsində ilk qələm təcrübəsi olsa da, təhkiyə, sənətkarlıq baxımından uğurlu sayıla bilər.

R.Atakişioğlu "Yurduma məktublar" publisistik yazısında da torpaqlarımızın ermənilər tərəfindən işğalına dözmür, mənəvi cəhətdən əzab çəkir, nankor erməniləri torpaqlarımızdan qovmağa və onları əzəli torpaqlarımızdan tez çıxıb getməyə çağırır. Çünki müəllif qəti əmindir ki, biz işğal olunmuş torpaqlarımıza yenidən dönəcəyik və qisasımızı onlardan birə-beş alacağıq. Bu qəti inamla da Rövşən Atakişioğlu ermənilərə müraciətlə belə yazır: "Tələsin, tələsin! Biz gələcəyik, hələ ölməmişik!... Yediyinizi, içdiyinizi burnunuzdan, gözünüzdən, qulağınızdan gətirməsək, bizə də türk oğlu türk deməsinlər, nankorlar!!!"

Məlumdur ki, Xocalı soyqırımı Azərbaycan tarixinə ən dəhşətli və faciəli səhifələrdən biri kimi daxil olmuşdur. XX əsrin ən böyük faciələrindən biri olan Xocalı soyqırımı aqressiv və cinayətkar erməni siyasətinin nəticəsidir. XX əsrin sonunda baş vermiş bu faciə təkcə Azərbaycan xalqına deyil, bütün insanlığa, bəşəriyyətə qarşı yönəlmiş ən ağır cinayətlərdən biridir. Xocalı soyqırımı XX əsrin Xatın, Xirosima və Naqasaki kimi dəhşətli faciələri ilə bir sırada dayanır.

R.Atakişioğlu kitabın "Xocalı soyqırımı şahidlərin dili ilə" publisistik yazılarında bu mövzuya bir daha qayıdır, Xocalı faciəsinin iştirakçıları və şahidləri olan Xocalı şəhər 2 saylı tam orta məktəbin müəllimələri – Məmmədova Sevda Teyyub qızının, Cəfərova Səidə Rəfiyyət qızının, Xocalı şəhər 2 saylı tam orta məktəbin laborantı Əbdülova Sevil Mürsəl qızının, Xocalı şəhər sakinləri – İmami Sahib Ağayar oğlunun, Səlimova Zənurə Razim qızının, Rüstəmova Səkinə Kərim qızının, Məhərrəmov Murad Cəmil oğlunun və başqalarının xatirələrini təsirli, yaddaqalan səhnələrlə təsvir edir. Müəllif sanki bununla bu qanlı faciənin unudulmamasına çalışır, özü isə sanki bir növ "Qisas qiyamətə qalmaz" ideyasının daşıyıcısına çevrilir.

Kitabın "Sözlük", "Qınamalar", "Bölgəmizdə işlənən bəzi frazemlər" hissələrində isə Rövşən Atakişioğlunun təcrübəli bir dilçi, eyni zamanda folklorçu istedadı üzə çıxır. Hiss olunur ki, bu hissələri hazırlayarkən müəllif böyük zəhmət çəkmiş, Laçın bölgəsinə aid xeyli toponimlər və folklor nümunələri toplamağa nail olmuşdur. Bu isə Rövşən Atakişioğlunun doğma el-obasına, yurduna layiqli bir övlad, əsl bir vətəndaş ərməğanıdır. Sizə bu yolda yeni-yeni yaradıcılıq uğurları arzu edir və belə kitablarınızın davamı gəlsin, Rövşən müəllim-deyirik.

**P.S. (Sözardı)** Mayın 18-də Laçının ermənilər tərəfindən işğalının 22-ci ildönümü idi. Demək olar ki, bütün kütləvi informasiya vasitələrində, o cümlədən, telekanallarda, radiolarda bu haqda geniş məlumat verildi, Laçınlı günlərə bir daha qayıdıldı, xatirələr baş alıb getdi... Telekanalların birində verilən bir epizod isə daha təsirli idi. Laçın şəhəri, onun təbii mənzərələri, gözəllikləri göstərilir, kadr arxasında isə müğənni yanıqlı və həzin səslə oxuyurdu:

*Bağçaların barı gül,*
*Yarı qönçə, yarı gül,*
*Gec açıldın, tez soldun,*
*Açmayaydın barı gül,*
*Ay Laçın, can Laçın,*
*Mən sənə qurban Laçın...*

Bu mahnını eşidəndə isə sanki adamın bütün qəlbi riqqətə gəlir, istər-istəməz könlü qubarlanırdı: "Gec açıldın, tez soldun..." Bəli, nə yazıqlar ki, bir müddətə olsa da, soldu Laçın... Ancaq mən inanıram ki, tarixin neçə-neçə sınağından şərəflə çıxan, Sultan bəy kimi qəhrəman igidlər yetirən, Qarabağ savaşında yüzlərlə şəhid verən Laçın bu sınaqdan da alnıaçıq, üzüağ çıxacaq. Laçın tezliklə işğaldan azad ediləcək, elindən-obasından didərgin düşən laçınlılar yenidən öz doğma yurd-yuvalarına qayıdacaqlar. Beləcə, Laçın köhnə yaralara məlhəm qoya-qoya yenə nəğməli-sözlü, sevgi-məhəbbətli ömrünü yaşayacaq. O zaman isə xanəndələr, müğənnilər ürəkdən və sevinclə belə oxuyacaqlar:

*Araz axar lil ilə,*
*Dəstə-dəstə gül ilə,*
*Mən yarımı sevirəm,*
*Şirin-şirin dil ilə,*
*Ay Laçın, can Laçın,*
*Mən sənə qurban Laçın...*



**Tahir ORUCOV,**
***Filologiya üzrə fəlsəfə doktoru, dosent,***
***AMEA Folklor İnstitutunun aparıcı elmi işçisi***

**UNUTMA!**

Laçın rayonu 18 may 1992-ci ildə erməni təcavüzkarları tərəfindən işğal edilib. İşğal nəticəsində Laçın şəhərində, Qayğı qəsəbəsində və 125 kənddə olan 13845 fərdi yaşayış evi, 48 sənaye, 63 kənd təsərrüfatı obyekti, 217 mədəni-maarif, 101 məktəb, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 142 səhiyyə, 460 ticarət obyekti itirilmişdir.

Qarabağ müharibəsində 333 nəfər şəhid, 225 nəfər əlil olmuş, 33 nəfər hər iki valideynini itirmiş, 5 nəfər Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. Laçın rayonu işğal edildikdən sonra rayonun 58299 nəfər əhalisi respublikanın 59 rayon və şəhərində müvəqqəti məskunlaşmışdır.




**“Bəxtiyar-4”** mətbəəsinin direktoru: **Bəxtiyar İSMAYILOV**
Kompüter və dizayn: **Araz YAQUBOĞLU**
Korrektor: **Elnur İRƏVANLI**
Operator: **Cəlal ARİFOĞLU**

Yığılmağa verilmişdir: **02.04.2014**
Çapa imzalanmışdır: **27.06.2014**
Şərti çap vərəqi: **6.** Sifariş **№15**
Kağız formatı: **70x100, 1/16**
Sayı: **500.** Qiyməti: **2 AZN**

Dərgi **“Bəxtiyar-4”** istehsal-kommersiya firmasında
hazır diapozitivlərdən çap olunmuşdur.
**E-mail:** baxtiyar54@rambler.ru
**Tel:** (+99412) 568-44-53, (+99450) 570-63-54
**Ünvan:** Bakı, Mir Cəlal, 83